*ELMİ İŞ* Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 19 Sayı: 4 / 68-71 ISSN: 2663-4619
*SCIENTIFIC WORK* International Scientific Journal. 2025 / Volume: 19 Issue: 4 / 68-71 e-ISSN: 2708-986X

DOI: https://doi.org/10.36719/2663-4619/114/68-71

**Ülkər Ələkbərova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
https://orcid.org/0009-0008-5741-4825
elekberovaulker9@gmail.com

# Nazim Bəykişiyevin səhnə tərtibatlarında məkan həlli

### Xülasə

Yüksək erudisiyaya malik olan Nazim Bəykişiyevin teatr tamaşalarına verdiyi səhnəqrafik quruluşlar öz zaman və məkan xüsusiyyətləri ilə seçilir. O, parlaq milli koloritdən istifadə edərək işıq və səhnə texnikasının imkanlarından məharətlə yararlanır. Rəssamın yaratdığı səhnə tərtibatlarında səth, məkan, işıq-ton, rekvizit, faktura və həcm kimi vizual təsir vasitələrinin qarşılıqlı dinamikası xüsusi önəm daşıyır. Nazim Bəykişiyevin səhnə tərtibatları təkcə vizual estetik baxımdan deyil, eyni zamanda obrazların daxili dünyasının açılmasına da xidmət edir. Xüsusilə “Hamlet” və “İblis” tamaşalarında bu yanaşma daha qabarıq şəkildə özünü göstərir. Hər iki tamaşanın səhnə tərtibatı əsərlərin psixoloji və fəlsəfi aspektlərini daha dərin şəkildə ifadə etməklə tamaşaçıya güclü təsir bağışlamış və obrazların daxili ziddiyyətlərini ön plana çıxarmışdır. Həm “Hamlet”, həm də “İblis” tamaşalarında qaranlıq və tünd rəng çalarlarından istifadə olunur. Burada hakimiyyət və güc diktaturasına da diqqət çəkilir və bu mövzu müxtəlif simvolik elementlər vasitəsilə ifadə olunur. Bundan əlavə, tamaşaların vizual üslubu və istifadə olunan rekvizitlər qəhrəmanların daxili mübarizəsini və psixoloji vəziyyətlərini əks etdirmək baxımından xüsusi əhəmiyyət daşıyır. Bununla yanaşı, hər iki əsərdə insanın öz taleyi ilə apardığı mübarizə, daxili qarşıdurmalar və mənəvi çöküntü kimi məsələlər qabardılır ki, bu da tamaşaların ideya dərinliyini daha da artırır.

***Açar sözlər:*** *Nazim Bəykişiyev, səhnə tərtibatı, məkan həlli, teatr səhnəqrafiyası, “Hamlet”, “İblis”, Azərbaycan teatrı*

**Ulker Alakbarova**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/0009-0008-5741-4825
elekberovaulker9@gmail.com

# Spatial Solutions in Nazim Baykishiyev's Stage Designs

### Abstract

The stage designs created by Nazim Beykishiyev, who possesses high artistic erudition, are distinguished by their unique spatial and temporal features in theatrical performances. By skillfully using bright national colors, lighting, and stage technologies, he creates powerful visual images. His stage decorations emphasize the dynamic interplay of visual elements such as surface, space, light-tone, props, texture, and volume. Beykishiyev's stage solutions serve not only aesthetic purposes but also reveal the inner world of the characters. This approach is particularly evident in the plays “*Hamlet*” and “*Iblis*”. The stage designs of both plays emphasize their psychological and philosophical aspects, deeply affecting the audience and highlighting internal conflicts. Dark and deep color tones dominate both productions. Issues like power and dictatorship are also underlined through symbolic elements. Moreover, the visual style and props reflect the characters' internal struggles and psychological states. Both works emphasize human destiny, inner conflicts, and moral collapse, which add depth to the plays’ conceptual and aesthetic message.

 

**Keywords:** *Nazim Baykishiyev, stage design, spatial solution, theatre scenography “*Hamlet*” “*Iblis”, *Azerbaijani theatre*

## Giriş

Quruluşçu rəssam eskizlərin çəkilməsi, maketlərin və şablonların hazırlanması, ümumiyyətlə, tamaşanın tərtibatına dair bütün detalları əhatə edən geniş bilik və bacarığa malik olmalıdır. Tamaşa üzərində çalışan rəssamlar ümumi yaradıcı ideyanın ətrafında birləşərək fərdi töhfələri ilə bir məqsədə xidmət etməlidirlər. Yüksək erudisiyaya malik olan Nazim Bəykişiyevin teatr tamaşalarına verdiyi səhnəqrafik quruluşlar öz zaman və məkan xüsusiyyətləri ilə seçilir. O, parlaq milli koloritdən istifadə edərək işıq və səhnə texnikasının imkanlarından məharətlə yararlanır. A.V. Solloqub teatr dekorasiyalarının hazırlanması haqqında tədqiqatında deyir: “Rəsmin keyfiyyəti, ilk növbədə, onu yaradan rəssamın peşəkarlığından asılıdır, lakin ən bacarıqlı rəssam belə, keyfiyyətli materiallar – müxtəlif sərtlikdə qələmlər, uyğun kağız və digər vasitələr olmadan istədiyi nəticəyə nail ola bilməz” (Sollogub, 1995, s. 6). Rəssamın yaratdığı səhnə tərtibatlarında səth, məkan, işıq-ton, rekvizit, faktura və həcm kimi vizual təsir vasitələrinin qarşılıqlı dinamikası xüsusi önəm daşıyır.

**Tədqiqat**

Rejissor Azərpaşa Nemətovun quruluş verdiyi və premyerası 30 mart 2002-ci ildə baş tutan “Hamlet” tamaşasının dramatik və fəlsəfi mahiyyətini gücləndirən əsas elementlərdən biri Elçin Məmmədov və Nazim Bəykişiyevin hazırladıqları səhnə tərtibatıdır. Əsərin mərkəzi ideyası insanın öz seçimləri, azad iradəsi və taleyi qarşısında keçirdiyi daxili əzab və mübarizəni əks etdirməkdir ki, bu da səhnə tərtibatında qaranlıq bir atmosfer vasitəsilə vurğulanmışdır. Tamaşanın vizual tərtibatında dumanlı və tünd tonlar dominantdır. İşıqlandırmanın qeyri-müəyyən və dəyişkən xarakteri tamaşaçını Hamletin və digər obrazların daxili mübarizəsinə daha dərindən cəlb edir. Aydın Talıbzadə “Hamlet. Omlet. Pamflet” məqaləsində yazır: “Hər tirdən qalan kəndirlərlə iri projektor salladılıb. Projektor sanki qalstuk xaltasının düyün yumrusunu xatırladır: bu yumrudan aşağı isə barmaq yoğunluğunda ikiqarışlıq bir ip uzanır. Səhnəyə çıxan hər bir aktyor durduğu yerdəcə ipi dartıb, guya ki, projektoru yandırır və oyuna qoşulur” (Talıbzadə, 2002). Ümumilikdə, “Hamlet” tamaşasına verilən səhnə tərtibatı və vizual həll, əsərin fəlsəfi dərinliyini və emosional təsirini gücləndirərək, tamaşaçının həm intellektual, həm də psixoloji baxımdan hadisələrin axarına cəlb olunmasını təmin edir. Belə ki, rəssam səhnə tərtibatı vasitəsilə rejissor yozumuna hadisələrin cərəyan edəcəyi predmet reallığı bəxş edir. Professor İlham Rəhimlinin “Üç əsrin yüz otuz ili” kitabında Azərpaşa Nemətovun rejissorluq üslubu haqqında deyilir: “Onun hazırladığı, janrından asılı olaraq, hər tamaşanın özünün məxsusi ritm ahəngi var” (Rəhimli, 2003, s. 49). Bu fikri “Hamlet” tamaşasında da görmək mümkündür. Əsərin ritmi ağır və ləngərlidir ki, bu da faciənin mahiyyətini gücləndirir və tamaşaçının diqqətini hadisələrin psixoloji dərinliyinə yönəldir. Məryəm Əlizadə Azər Paşa Nemətin “Hamlet” tamaşası haqqında “Dövrün qısa icmalı” məqaləsində yazır: “Əsərin vizual görüntüsü rejissor konsepsiyasının həm bədii-estetik, həm ideya-məzmun, həm də funksional səciyyələrini əks etdirməlidir” (Əlizadə, 2003). Tamaşanın dekorasiyası və personajların geyimləri əsərin baş verdiyi qədim dövrün estetikasını əks etdirir. Bu, vizual mühitin realistik təsirini artırmaqla yanaşı, tamaşaçıya Hamletin yaşadığı dövrün ab-havasını hiss etdirməyə imkan yaradır. Fuad Poladovun Hamlet obrazını gənc və romantik bir qəhrəman kimi deyil, daha çox kinayə ilə dolu, həyatın acı reallıqlarını dərk etmiş yetkin bir insan kimi təqdim etməsi tamaşaya xüsusi yeni bir çalar qatır. Hakimiyyət problemi tamaşada yalnız fərdi bir faciə kimi deyil, həm də siyasi və sosial müstəvidə təqdim olunmuşdur. Klavdinin obrazı vasitəsilə diktatorluq, gücün sui-istifadəsi və hakimiyyət uğrunda mübarizə kimi məsələlər vurğulanmışdır. Bu isə tamaşanın təkcə Şekspirin dövrünə deyil, ümumilikdə cəmiyyətlərin siyasi reallıqlarına işıq salan universal bir əsər olduğunu bir daha təsdiqləyir. “Hamlet” faciəsində yer alan “Olum, ya ölüm – budur məsələ” dilemması (Mustafa, 2004, s. 206) əsas fəlsəfi məqam kimi tamaşadan da qırmızı xətt olaraq keçir. Hamlet mürəkkəb bir seçim qarşısında qalır: o, ya reallığı olduğu kimi qəbul etməli, ya da atasının

intiqamını alaraq ədaləti bərpa etməlidir. Onun iradəsi zəif görünsə də, sonda atasının intiqamını almaq qərarına gəlir ki, bu da faciənin dramatik inkişafına təsir edir.

Mehdi Məmmədovun Hüseyn Cavidin “İblis” əsəri əsasında hazırladığı tamaşanın (1983) səhnə tərtibatı da Elçin Məmmədov və Nazim Bəykişiyevə məxsus idi. Əsərin əsas ideyası müharibəni törədən qüvvələrə, ədalətsiz müharibələrə qarşı nifrət hissinin oyadılmasıdır. Tamaşanın vizual həlli dramatik atmosferin yaradılmasına xidmət edir. Qaranlıq səhnə tərtibatı, kölgəli və dumanlı məkan təsvirləri tamaşanın gərgin və mistik ruhunu vurğulayır. Səhnədə dominant olan qırmızı rəng iblisi simvolizə edir və onun təsir dairəsinin genişliyini göstərir. Bu rəng həm də atəş, qəzəb, günah və məhv kimi anlayışlarla assosiasiya olunur. Səhnədə istifadə olunan rekvizitlər də iblisin gücünü və onun manipulyativ xarakterini qabardır. Məsələn, şərab qədəhi iblisin gücünün metaforası kimi təqdim edilir. O, Arifi yoldan çıxararaq, nəticədə daha böyük qətliamlara səbəb olur. Tamaşanın vizual həlli iblisin fitnəkarlığını və insan psixologiyasına təsir gücünü tamaşaçıya hiss etdirməyi bacarır. Səhnə tərtibatı həmçinin personajların psixoloji durumunu və daxili mübarizəsini ön plana çıxarmaq üçün minimalist, lakin simvolik elementlərdən istifadə edir. Bu tamaşada Hamlet Xanızadənin ifasında İblis rolu xüsusi qeyd olunmalıdır. O, İblisin sanki səhnədə real varlıq kimi hiss olunmasını təmin edərək, personajın manipulyativ və qorxunc tərəflərini ustalıqla canlandırmışdır. Hamlet Xanızadənin ifası ilə səhnə tərtibatının harmoniyası tamaşanın təsir gücünü daha da artırmışdır. Səlahəddin Xəlilov Cavid fəlsəfəsi kitabında “İblis” faciəsi haqqında yazır: “İblis dünyadakı vəhşətlərdən qaçan, bir növ tərki-dünyalıq mövqeyi tutan insanı həyata daxil edir” (Xəlilov, 1996, s. 60). Bu fikirdən belə nəticə çıxarmaq olar ki, İblis insanın sakit və harmonik bir həyat sürməsinə imkan vermir. İnsan nə qədər qandan və vəhşətdən uzaqlaşmağa çalışsa da, onu yenidən bu çəmbərə çəkən bir qüvvə mövcuddur ki, bu da İblisin özüdür. O, insanı daim günaha sürükləyir. Tamaşada da eyni motiv müşahidə olunur: Arif nə qədər müqavimət göstərsə də, İblis onun zəif nöqtəsini taparaq onu günaha sövq edir. Arifin əsas zəifliyi isə Rənaya olan sevgisidir. Lakin bu sevgi heç bir nəticə vermir və Arif həm sevgisinin qurbanına çevrilir, həm də öz qardaşının qatili olur.

Bu iki tamaşanı (“Hamlet” və “İblis”) birləşdirən əsas xüsusiyyətlərdən biri onların səhnə tərtibatında qaranlıq tonların üstünlük təşkil etməsidir. Hər iki tamaşada hakimiyyət və güc diktaturasına diqqət çəkilir və bu mövzu müxtəlif simvolik elementlər vasitəsilə ifadə olunur. Bundan əlavə, tamaşaların vizual üslubu və istifadə olunan rekvizitlər qəhrəmanların daxili mübarizəsini və psixoloji vəziyyətlərini əks etdirmək baxımından xüsusi əhəmiyyət daşıyır. Bununla yanaşı, hər iki əsərdə insanın öz taleyi ilə apardığı mübarizə, daxili qarşıdurmalar və mənəvi çöküntü kimi məsələlər qabardılır ki, bu da tamaşaların ideya dərinliyini daha da artırır. Aydın Talıbzadənin “Mehdi müəmması” kitabında “İblis” tamaşası haqqında oxuyuruq: “Olum, ya ölüm? İnsan, ya İblis? Bəlkə... Yoxsa... Allah, ya İblis?” (Talıbzadə, 2009, s. 337).

Eynilə “İblis” tamaşasında da Arif, Hamlet kimi, çətin bir seçim qarşısında qalır. O, ya İblisə boyun əyərək onun “oyuncağına” çevrilməli, ya da öz ideallarına sadiq qalaraq “şərəfli” bir ömür sürməlidir. Lakin Arif bu çətin sınaqdan keçə bilmir və iblisin təsiri altına düşərək onun iradəsinə tabe olur. Hamlet tərəddüd içində qalsa da,öz vicdanını qoruyub saxlamağa çalışır, Arif isə bu sınaqdan məğlub çıxaraq iblisə tabe olur. Mehdi Məmmədovun quruluş verdiyi “İblis” tamaşasının final səhnəsi xüsusilə diqqətçəkicidir. Hamlet Xanızadənin ifasında səsləndirilən son monoloqda o, insanın daxili ziddiyyətlərini və xəyanət anlayışını qabardır:

İblis nədir?
Cümlə xəyanətlərə bais…
Hər kəsə xain olan insan nədir? Ya insana xain olan insan nədir?
İblis… İblis… İblis…

Bu monoloqu tamamladıqdan sonra İblis sanki dərin təəssüf hissi keçirərək yerə çökür. Hüseyn Cavidin orijinal mətnindən fərqli olaraq burada “ya insana xain olan insan nədir?” ifadəsinin işlədilməsi səhnənin dramatik təsirini daha da artırır. Bu ifadə, insanın digər insanlara qarşı xəyanət edə biləcəyini və törədilə bilən dəhşətlərin bəşəriyyətin öz mahiyyətindən qaynaqlandığını vurğulayır. Beləliklə,

tamaşa insanın daxili mübarizəsini və mənəvi düşkünlüyünü ön plana çıxararaq, onun İblisdən daha təhlükəli ola biləcəyi fikrini tamaşaçıya aşılayır.

İlham Rəhimlinin "Sənətdə keçən ömür" kitabında deyir: "İblis tamaşası iblislik fəlsəfi-etik konsepsiyasının çoxmənalı tərəflərinə insanın idrakı və əməli, şəxsiyyət və cəmiyyət, hərb və sülh, ölüm və ölməzlik ideyaları qatlarında cavab axtaran səhnə faciə-dastanı təsiri bağışlayırdı" (Rəhimli, 1992, s. 28). Doğrudan da, "İblis" tamaşası yalnızca sadə bir şər hekayəsi deyil, əksinə, insan təbiəti və cəmiyyətdə mövcud olan dərin problemlərə toxunan fəlsəfi bir əsərdir. Tamaşada insanın müharibəyə meyilli olması açıq şəkildə özünü göstərir. İlham Rəhimlinin bu fikrindən çıxış edərək belə qənaətə gəlmək olar ki, tamaşa insanı fundamental etik və mənəvi suallar ətrafında düşünməyə vadar edir.

## Nəticə

Nazim Bəykişiyevin səhnə tərtibatları təkcə vizual-estetik baxımdan deyil, eyni zamanda obrazların daxili dünyasının açılmasına da xidmət edir. Xüsusilə "Hamlet" və "İblis" tamaşalarında bu yanaşma daha qabarıq şəkildə özünü göstərir. Hər iki tamaşanın səhnə tərtibatı əsərlərin psixoloji və fəlsəfi aspektlərini daha dərin şəkildə ifadə etməklə tamaşaçıya güclü təsir bağışlamış və obrazların daxili ziddiyyətlərini ön plana çıxarmışdır. Həm "Hamlet", həm də "İblis" tamaşalarında qaranlıq və tünd rəng çalarlarının istifadəsi, hakimiyyət və güc diktaturası kimi məsələlərin vurğulanması səhnə tərtibatının dramaturji məzmunla vəhdətini nümayiş etdirir. Ümumilikdə, Nazim Bəykişiyevin səhnəqrafiyası Azərbaycan teatr sənətində dərin psixoloji və fəlsəfi məqamları əks etdirən mühüm yaradıcılıq nümunəsi kimi çıxış edir və müasir teatr tədqiqatları üçün qiymətli örnəkdir.

## Ədəbiyyat

1. Əlizadə, M. (2003, İyun 12). *Dövrün qısa icmalı*. 525-ci qəzet.
2. Xəlilov, S. (1996). *Cavid fəlsəfəsi. 1-ci kitab: "İblis"də fəlsəfi motivlər*. Bakı: Qanun, 112.
3. Mustafa, S. (2004). Vilyam Şekspir. Seçilmiş əsərləri (I cild). Bakı: Öndər nəşriyyat, 736.
4. Rəhimli, İ. (1992). *Sənətdə keçən ömür*. Bakı: Gənclik, 328.
5. Rəhimli, İ. (2003). *Üç əsrin yüz otuz ili.* Bakı: QAPP-POLİQRAF Korporasiya.
6. Sollogub, A.V. (1995). *Proyektirovaniye i vypolneniye chertezhey na teatral'nye dekoratsii: Uchebnik dlya studentov postanovochnogo fakul'teta*. Sankt-Peterburg: Sankt-Peterburgskaya gosudarstvennaya akademiya teatral'nogo iskusstva.
7. Talıbzadə, A. (2002, May 8). *Hamlet.* Pamflet. Bizim əsr.
8. Talıbzadə, A. (2009). *Mehdi müəmması və ya sənətdə konseptual hamletizm.* Bakı: Elm və Təhsil, 372.

Daxil oldu: 21.12.2024
Qəbul edildi: 26.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/72-77

**Narmin Sadigova**
Baku State University
Master student
https://orcid.org/0009-0003-6860-0264
sadiqovanarmin07@gmail.com

# Culpa in Contrahendo: A Comparative Analysis of Pre-Contractual Liability in Different Legal Systems

## Abstract

The term “Culpa in contrahendo”, meaning “pre-contractual liability”, was first introduced by the German jurist Rudolf von Jhering in 1861. Although this doctrine later became widely recognized and is now an integral part of almost all legal systems, there is still no unified approach regarding its content and the basis for its formation. In fact, the absence of a uniform approach is largely due to the fact that culpa in contrahendo is applied in countries belonging to different legal systems. In civil law (continental law) jurisdictions, this doctrine is primarily reflected as an expression of the duty to act in good faith during the pre-contractual negotiation phase. However, courts in common law jurisdictions (Anglo-Saxon law) consider that pre-contractual liability may be regulated based on various legal grounds, depending on the circumstances of the case. This article analyzes the origin and development of the culpa in contrahendo doctrine, the different approaches taken in various legal systems, judicial decisions from different jurisdictions, and the essential elements required for establishing pre-contractual liability. Furthermore, the article examines the relevant provisions and existing gaps in national legislation regarding pre-contractual liability and discusses the necessary legal reforms to address these gaps.

***Keywords:*** *culpa in contrahendo, elements of culpa in contrahendo, honesty, preliminary negotiations, negative damages*

**Nərmin Sadıqova**
Bakı Dövlət Universiteti
magistrant
https://orcid.org/0009-0003-6860-0264
sadiqovanarmin07@gmail.com

# Culpa in Contrahendo: Müqaviləyəqədərki məsuliyyətin müxtəlif hüquq sistemlərində müqayisəli hüquqi təhlili

## Xülasə

“Culpa in contrahendo”- “müqaviləyə qədərki məsuliyyət” termini ilk dəfə 1861-ci ildə Almaniyalı hüquqşünas Rudolf von Jhering tərəfindən işlədilmişdir. Bu doktrina sonradan geniş yayılaraq, demək olar ki, bütün dövlətlərin hüquq sisteminin ayrılmaz tərkib hissəsini təşkil etsə də, onun məzmununa, bu məsuliyyətin formalaşma əsaslarına münasibətdə hələ də vahid bir yanaşma mövcud deyildir. Əslində, belə bir yanaşmanın formalaşdırılmasının mümkün olmaması daha çox Culpa in contrahendonun tətbiq edildiyi ölkələrin müxtəlif hüquq sisteminə mənsub olmasından irəli gəlir. Belə ki, qitə (kontinental və ya sivil hüquq) hüquq sisteminə mənsub olan ölkələrin qanunvericiliyində bu doktrina daha çox müqaviləyəqədərki danışıqlar mərhələsində vicdanlılıq prinsipinə əməl etmənin bir təzahürü kimi öz əksini tapır. Ümumi hüquq (ingilis sakson) sisteminə aid olan ölkələrin məhkəmələri isə hesab edirlər ki, müqaviləyəqədərki məsuliyyətin tənzimlənməsi işin hallarından asılı olaraq müxtəlif əsaslara söykənə bilər. Məqalədə “culpa in contrahendonun” yaranma və inkişaf tarixi, müxtəlif dövlətlərin qanunvericiliklərində bu məsələnin tənzimlənmə üsulları, fərqli hüquq sisteminə aid məhkəmələrin qərarları, müqaviləyəqədərki məsuliyyətin

formalaşması üçün zəruri olan elementlərin hər biri ayrılıqda təhlil edilmişdir. Həmçinin qarşılıqlı olaraq, milli qanunvericilikdə müqaviləyəqədərki məsuliyyətin nizamlanması sahəsində mövcud olan normalara və bu sahədəki boşluqlara, həmin boşluqların aradan qaldırılması üçün zəruri olan dəyişikliklərə də toxunulmuşdur.

***Açar sözlər:*** *müqaviləyəqədərki məsuliyyət, müqaviləyəqədərki məsuliyyətin elementləri, vicdanlılıq, ilkin danışıqlar, neqativ ziyan*

## Introduction

In ancient Rome, the obligations originated from contracts, the ex contractu, or from delicts, ex delicto. Contracts were instruments to trade, while delicts were acts with fault, punishable by law and burdened by private obligations (Mustafaraj, 2019, p. 81). But not all obligations arise from contracts (ex contractu) or delicts (ex delicto). There were situations where obligations arose in ways that resembled contractual or delictual relationships but did not fully meet their legal definitions. To address these cases, Roman jurists introduced the concepts of quasi-contracts (quasi ex contractu) and quasi-delicts (quasi ex delicto). Roman law contains rules that relate to trust, care, information, and responsibility in case of failure of performance.

Although Roman law does not provide the pre-contractual stage, these rules can be interpreted as part of the concept of culpa in contrahendo whereby the doctrine of culpa and controversy delivered by Jhering has also stemmed (Mustafaraj, 2019, p. 81).

Jhering first recognized duty of good faith in the precontractual stage in his famous article called “Culpa in Contrahendo” published in1861. The impact of this article has been wide. When asked about precontractual liability and the duty of good faith and fair dealing in civilian jurisdictions, comparatists and jurist immediately refer to Jhering’s concept of culpa in contrahendo (Arunachalam, 2002).

Jhering advanced the thesis that damages should be recoverable against the party whose blameworthy conduct during negotiations for a contract brought about its invalidity or prevented its perfection (Kessler & Fine, 1964, p. 401).

Jhering argued that as in the case of existing contractual relationships, even in the case of negotiating to sign a contract, the parties should be protected from the rules not to act with negligence (Ben-Dror, 1983, p. 147). Jhering advocated the idea that these are contractual obligations because the contracting party passes from the sphere of negative extra contractual obligations to the positive sphere of contracts. Since the purpose and natural outcome of entering into negotiations is the conclusion of a contract, the contractual obligations extend to the negotiation stage. If one party creates by its fault, a seemingly non-existent contract, it must compensate the other party for the damage caused by the belief in that appearance.

The theory behind this doctrine is not limited to the German legal system - it has also been incorporated into the legal frameworks of most civil law countries through statutory provisions. For example, under French law, liability typically lies where one party enters into negotiations without having any intent to contract, yet creates a reasonable expectation in the other party that a contract will be forthcoming so that the other incurs substantial precontractual expenses (Nedzel, 1997, p. 139).

## Research

### 1. Culpa in Contrahendo in different state legislations

#### İtaly Law

In Italy, Article 1337 of the Italian Civil Code expressly establishes a duty of good faith governing pre-contractual negotiations. It states that the parties, during the negotiation and formation of a contract, must act in good faith. Furthermore, Article 1338 of the same code establishes that the party who knows or should know of the existence of an invalidity in the contract and does not inform the other party must restore damages to the party who was confident in the validity of the contract (Novoa, 2005, p. 586).

**Swiss Law**

Swiss law provides a clear and structured approach to the regulation of culpa in contrahendo. It defines the pre-contractual phase as the period during which parties explore the possibility of forming a contract, negotiate its terms, and take necessary steps toward its conclusion. This phase begins when one party initiates contact with another for contractual purposes and ends either when the offer is rejected or when the contract is finalized. Swiss law recognizes that negotiations establish a legal relationship between the parties, imposing pre-contractual liability when one party causes harm to the other by violating pre-contractual obligations. These obligations arise from the principle of good faith, which governs interactions between parties.

**English law**

In English law, no pre-contractual liability can be spoken of unless a contract is completed. English law follows a liberal approach, viewing individuals as independent economic agents who take risks and bear the consequences of their decisions. Unlike civil law jurisdictions, English law does not impose general duties of good faith, disclosure, or confidentiality during negotiations. Instead, it adopts an "all-or-nothing" approach—either parties are negotiating freely without legal obligations, or they are bound by a contract and can seek protection in court (Michonski, 2016, p. 158).

**The landmark case Walford v. Miles (House of Lords)** established that a general duty of good faith does not exist in English law. In this case, Miles (the seller) promised Walford (the potential buyer) not to consider other offers if Walford provided a letter of comfort from his bank, which he did. However, Miles breached this promise by selling to a third party. The House of Lords ruled that such a lock-out agreement must specify a time frame; otherwise, it is unenforceable due to uncertainty. Additionally, the court emphasized that parties in negotiations have conflicting interests and are free to withdraw at any time. Thus, there is no implied duty to negotiate in good faith under English law.

**In Petromec v. Petroleo,** however, the House of Lords, having distinguished the case from Walford v. Miles, deviated from the precedent stated therein and allowed the two parties to enter a binding agreement which expressly stated the rather general obligation of conducting negotiations in good faith. However, the legal status of such an agreement hinges upon a clear formulation of the parties' obligations (a detailed explanation of what the parties mean by good and bad faith) and the judges' ability to determine the nature, scope and consequences of the breach. The tendency to acknowledge adequately concretised good faith veiled in the parties' will seems to be steadily gaining judicial acclaim (Michonski, 2016, p. 159-160).

**American law**

Courts under a common law system approach pre-contractual liability in a different way. They consider that possible bases of precontractual liability in such a situation can be grouped under four headings: first, unjust enrichment; second, misrepresentation; third, specific promise [Promissory Estoppel]; and fourth, general obligation (Novoa, 2005, p. 588).

For example, Misrepresentation is a significant factor that might result in legal repercussions in courts that use the common law system. If a party makes false statements or representations during the pre-contractual period, and the other party relies on these misrepresentations to its detriment, then the party that made the false statements may be held accountable for the injury that was caused as a result of the misrepresentations. Similar to the previous example, negligence during the pre-contractual phase, such as failing to exercise reasonable care when making statements or disclosures, can also result in legal repercussions (Triyadi, 2023).

**Elements of Culpa in Contrahendo**

Elements of Culpa in Contrahendo are: (1) preliminary negotiations; (2) a breach of the duty to bargain in good faith; (3) causation-in-fact; and (4) compensable damages.

**Preliminary negotiations**

A contract is not a legal transaction that is established instantly. The formation of a contract requires the existence of a process. Before a contract is formed, the parties engage in negotiations regarding its content, terms, and the rights and obligations it entails. The length of these

negotiations may vary depending on the nature of the contract, circumstances, and conditions (Arıkan, 2009, p. 59).

At the pre-contractual stage the parties are usually not bound by any agreement regarding the procedure for contract formation. It has always been conventional that the contract formation procedure is informal and based on usages and ethical rules established in a particular business community. Therefore, the law initially abstained from interfering with the contract formation procedure and did not impose any obligations on the parties as to the manner in which such negotiations should be conducted. The only contract formation procedure that with the passage of time the law came to recognize was the classic procedure (by means of making an offer and its acceptance). As concerns the procedure for contract formation through negotiations, for a long time the law remained completely silent (Kucher, 2004, p. 6).

The **venturesome (aleatory) theory** of pre-contractual negotiations is based on the idea that each party assumes its own risks during the negotiation process. This theory relies on three fundamental assumptions.

First, any interference in the contract formation process before the parties have undertaken contractual obligations or committed a tort would violate the freedom of contract principle, which is a core aspect of contract law. Second, imposing restrictions on negotiations could discourage parties from engaging in discussions, potentially leading to fewer contracts. However, economic studies have earnestly proved that not only will such interference not be a deterrent, but it can actually result in the growth of the number of contracts, as the parties to the negotiations would know the game rules and would thus feel more comfortable and confident when commencing negotiations (Bebchuk & Ben-Shahar, 1996). Third, the theory maintains that unless a party's conduct falls within formal legal rules, it should be considered legally indifferent and have no legal consequences.

**A breach of the duty to bargain in good faith**

Even where the doctrine of **good faith is accepted**, there are wide differences of opinion over the meaning of the term good faith. For example, U.S. courts, in order to justify their decisions based on the good faith doctrine, have typically applied one of three different definitions of good faith (Farnsworth, 1995, p. 59). The first, Justice Antonin Scalia viewed it as merely reinforcing basic contract principles, particularly in implying terms in agreements. Second, Robert Summers introduced an "excluder" analysis, defining good faith as the absence of bad faith behaviors like evading the spirit of the bargain or interfering with performance. Third, Steven Burton, in contrast, proposed the "foregone opportunity" theory, arguing that good faith restricts a party from using discretion to regain opportunities sacrificed when the contract was formed.

The duty to negotiate in good faith imposes essential obligations on parties during pre-contractual discussions. These include maintaining confidentiality (**obligation of reserve**), safeguarding exchanged materials (**obligation of custody and conservation**), and engaging in negotiations with a genuine intent to reach an agreement (**obligation of seriousness**). A breach of these duties can result in legal consequences, ensuring fairness and preventing harm during the negotiation process.

**Causation-in-fact**

In both civil and common law jurisdictions, the plaintiff must establish a direct link between the defendant's actions or omissions and the damage suffered (**causation-in-fact**). While often overlooked in pre-contractual liability cases, causation can become complex if the defendant argues that the plaintiff's misconduct led to the breakdown of negotiations. In such situations, both parties' behavior must be evaluated, and if both are at fault, liability may be apportioned under a contributory negligence standard.

**Compensable damages**

Jhering discussion contained two lines of thought, which greatly influenced civilian legal systems: (1) liability for fault (culpa) in contracting, and (2) classification of damages in to **positive and negative damages** (Nedzel, 1997, p. 113)

In the culpa in contrahendo doctrine, **injury is a last element**, as liability cannot arise without actual damage. Similar to common law torts and civil law extra-contractual liability, mere bad faith

in negotiations does not automatically lead to responsibility unless it causes harm. Even if a party unlawfully withdraws from negotiations, no liability arises unless the other party suffers a tangible loss. As highlighted in Satellite III, courts have recognized that unjust termination of pre-contractual negotiations may result in extra-contractual liability, but only if damages can be proven.

**The Satellite III case** illustrates the scope of damages under the culpa in contrahendo doctrine. The court examined various Civil Code commentators and requested memoranda from both parties, revealing divergent views on damages. Plaintiffs argued that willful withdrawal from negotiations should result in reliance (negative) damages, whereas bad faith negotiations should lead to expectation (positive) damages. However, the court favored a passive approach, recognizing only negative contractual interest, which includes expenses incurred due to reliance on negotiations but excludes lost opportunities. This aligns with German doctrine, which focuses on damage to trust and reliance costs rather than lost profits.

**Culpa in Contrahendo in Azerbaijan Legislation**

Culpa in Contrahendo in Azerbaijan Legislation is regulated by Article 386 of Civil Code.

**386.1.** Except for cases where an obligation arises due to causing damage, unjust enrichment, or other grounds provided by this Code, an obligation must be based on a contract between its participants.

**386.2.** Obligations specified in Article 385 of this Code may also arise from the preparation of a contract.

**386.3.** A participant in negotiations may demand compensation from another participant for expenses incurred in attempting to conclude a contract if the contract was not concluded due to a fault of the another participant (Azərbaycan Respublikasının Mülki Məcəlləsi).

If we interpret the phrase "based on the preparation of a contract" separately in a textual manner, it may cause confusion. However, it is clearly evident that this provision applies to culpa in contrahendo, and considering this, the phrase should be understood as "based on contract negotiations". Therefore, it is appropriate to amend the provision related to pre-contractual liability in the Civil Code of the Republic of Azerbaijan. First and foremost, this should be implemented by modifying the phrase "obligations may also arise based on the preparation of a contract" to "obligations may also arise based on contract negotiations." This is necessary because if culpa in contrahendo is applied in the law, it must be implemented more clearly so that the provision can be correctly interpreted textually as well (Əmirli, 2015, p. 64-65).

## Conclusion

The doctrine of culpa in contrahendo plays a significant role in shaping pre-contractual liability across different legal systems. While civil law jurisdictions, such as Germany and Switzerland, recognize a well-defined framework that imposes duties of good faith and fair dealing during negotiations, common law systems, particularly English law, take a more restrictive approach, rejecting a general duty to negotiate in good faith. Instead, English law adheres to the principle of freedom of contract, allowing parties to withdraw from negotiations without liability unless specific contractual obligations or misrepresentations exist.

One of the core challenges in applying culpa in contrahendo is determining causation and damages. Courts must assess whether a party’s wrongful conduct directly resulted in the other party’s loss. The civil law approach often compensates only for negative interest (reliance damages)—covering costs incurred due to trust in negotiations—whereas expectation damages (positive interest) are typically excluded. This distinction highlights the passive nature of pre-contractual liability, as it aims to restore the injured party to their prior position rather than enforce the lost contractual benefits.

The regulation of culpa in contrahendo in Azerbaijan is now expressly recognized by law, as in other civil law jurisdictions. However, textual ambiguities in Civil Code can create interpretation challenges. In order to ensure legal certainty in this area, it is necessary for the Civil Code to more precisely express the provision that encompasses culpa in contrahendo. If culpa in contrahendo is

recognized in law, it must be expressly and unambiguously formulated so that its textual interpretation aligns with its doctrinal application.

## References

1. Arıkan, M. (2009). Culpa in contrahendo sorumluluğu. S*elçuk Üniversitesi Hukuk Fakultesi dergisi*, 17 (1) , 69-89. https://doi.org/10.15337/SUHFD.2017.119
2. Arunachalam, A. (2002). An analysis of the duty to negotiate in good faith: precontractual liability & preliminary agreements. *University of Georgia School of Law.* 1-96.
3. Azərbaycan Respublikasının Mülki Məcəlləsi https://e-qanun.az/framework/46944
4. Bebchuk, L.A. & Ben-Shahar, O. (1996). Pre-contractual Reliance. *Harvard Law School. 1-42.*
5. Ben-Dror, Y. (1983). The Perennial Ambiguity of Culpa in Contrahendo. *The American Journal of Legal History*, 27(2), 142–198. *https://doi.org/10.2307/845040*
6. Əmirli, M. (2015). Culpa in contrahendo – Müqaviləyəqədərki məsuliyyət. *Bakı Dövlət Universiteti Tələbə Hüquq Jurnalı*, 1, 59-66.
7. Farnsworth, E. A. (1995). Duties of Good Faith and Fair Dealing Under the UNIDROIT Principles, Relevant International Conventions, and National Laws. *Tulana University, School of Law*, 47-63.
8. Kessler, F. & Fine, E. (1964). Culpa in Contrahendo, Bargaining in Good Faith, and Freedom of Contract: A Comparative Study. *Harward Law Review*, 77, 401-448.
9. Kucher, A. (2004). Pre-contractual liability: protecting the rights of the parties engaged in negotiations. *Nyu School of law, 1-42.*
10. Michonski, D. (2016). Contractual or Delictual? On the Character of Pre-contractual Liability in Selected European Legal Systems. *Comparative Law Review,* 20 (151), 151-175. DOI:10.12775/CLR.2015.016
11. Mustafaraj, B. (2019). Modern legal systems and the principle of "Culpa in Contrahendo": A review of the Albanian model of pre-contractual liability on a Roman-Germanic model reference. *Academicus International Scientific Journal,* 19(8), 80-94. DOI:10.7336/academicus.2019.19.06
12. Nedzel, N.E. (1997). A Comparative Study of Good Faith, Fair Dealing, and Precontractual Liability. *Tulane European and Civil Law Forum*, 12 (97), 98-158.
13. Novoa, R. (2005). Culpa in contrahendo: A comparative law study: Chilean law and the united nations convention on contracts for the international sale of goods (Cisg). *Arizona Journal of International & Comparative Law, 22(3), 583-612.*
14. Triyadi, G. (2023). Pre-contractual Liability and Oral Agreements in International Commercial Law. https://www.researchgate.net/publication/376981645 Pre contractual Liability_and Oral Agreements in International Commercial_Law

Received: 11.01.2024
Accepted: 20.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/78-83

**Ola Majthoub**
National University of Public Service
https://orcid.org/0009-0006-6436-3478
ola.majthoub@gmail.com

# Syrian Refugees' Access to Education and Healthcare in Jordan

## Abstract

This article examines the practices of social exclusion faced by Syrian refugees in Jordan, specifically with access to education and healthcare services. A qualitative study methodology was employed, involving in-depth interviews with 13 Syrian refugees residing in Mafraq Governorate. The study aims to understand how refugees perceive and navigate barriers to public services, as well as the resistance tactics they utilize to address these barriers. The results indicate that financial difficulties, geographic separation, and absence of legal paperwork are the primary obstacles to obtaining essential services. While several participants conveyed satisfaction with the services offered, others described experiences of exclusion, including school dropouts attributable to poverty and restricted access to healthcare resulting from insufficient insurance or financial assistance. Cultural attitudes and structural barriers further influence the persistence of exclusion. Refugees commonly rely on personal networks, informal assistance, and adaptive methods, like silence, disengagement, or selective involvement, to navigate these challenges. The article improves the comprehension of how structural and cultural forces converge to influence refugee experiences in host communities.

***Keywords:*** *Syrian refugees, social exclusion, education, healthcare, Jordan, public services, qualitative research, Mafraq Governorate, refugee integration, resistance strategies*

**Ola Majthub**
Milli Dövlət Xidməti Universiteti
https://orcid.org/0009-0006-6436-3478
ola.majthoub@gmail.com

# Suriyalı qaçqınların İordaniyada təhsil və səhiyyə xidmətlərinə çıxışı

## Xülasə

Bu məqalə İordaniyada yaşayan suriyalı qaçqınların təhsil və səhiyyə xidmətlərinə çıxış sahəsində üzləşdikləri sosial xaricetmə təcrübələrini araşdırır. Keyfiyyət əsaslı tədqiqat metodologiyası tətbiq olunmuş və Mafraq bölgəsində yaşayan 13 suriyalı qaçqınla dərindən müsahibələr aparılmışdır. Tədqiqatın məqsədi qaçqınların ictimai xidmətlərə çıxışda qarşılaşdıqları maneələri necə qavradıqlarını və bu maneələri aşmaq üçün istifadə etdikləri müqavimət taktikalırını anlamaqdır. Nəticələr göstərir ki, əsas maneələr maliyyə çətinlikləri, coğrafi uzaqlıq və hüquqi sənədlərin olmamasıdır. Bəzi iştirakçılar təqdim olunan xidmətlərdən məmnunluq ifadə etsələr də, digərləri yoxsulluq səbəbindən məktəbdən ayrılma və kifayət qədər sığorta və ya maliyyə dəstəyi olmadığı üçün səhiyyə xidmətlərinə məhdud çıxış kimi xaricetmə təcrübələrini təsvir etmişlər. Mədəni yanaşmalar və struktur baryerlər xaricetmənin davamlılığını daha da gücləndirir. Qaçqınlar bu çətinliklərin öhdəsindən gəlmək üçün adətən şəxsi əlaqələr, qeyri-rəsmi yardım və səssizlik, uzaqlaşma və ya seçici iştirak kimi uyğunlaşma üsullarına arxalanırlar. Məqalə, struktur və mədəni qüvvələrin birgə təsirinin qəbul edən cəmiyyətlərdə qaçqın təcrübələrinə necə təsir etdiyini anlamağa töhfə verir.

***Açar sözlər:*** *Suriyalı qaçqınlar, sosial xaricetmə, təhsil, səhiyyə, İordaniya, ictimai xidmətlər, keyfiyyət əsaslı tədqiqat, Mafraq bölgəsi, qaçqınların inteqrasiyası, müqavimət strategiyaları*

 

## Introduction

The Syrian civil war, commencing in 2011, has lead to considerable displacement of Syrians into neighboring countries, The Jordanian nation has had significant repercussions as a result of the onset of the crisis in 2011. Being in close proximity to the conflict, Jordan has become a destination for a substantial number of Syrian individuals seeking asylum, with the total number of refugees surpassing 666,000. This influx of refugees has had a dramatic impact on the demographic composition of Jordan, as almost one out of every 15 individuals in the country is now a refugee. The resettlement of Syrian refugees in Jordan has commenced, with a significant proportion (81.5%) choosing to establish themselves in prominent urban centers throughout the nation. Meanwhile, the United Nations and the Jordanian government have provided housing for the remaining 18.5% of refugees in two key camps (Moayerian & Stephenson Jr, 2023).

### Research

Recent estimates indicate that the country hosts around 135,000 Syrian refugee children enrolled in its public schools (Khawaldah & Alzboun, 2022), demonstrating the country's dedication to integrating refugees into its educational services. Moreover, Registered refugees have access to healthcare services at public health centers and government hospitals, usually at the non-insured Jordanian cost (Khawaldah & Alzboun, 2022).

Nevertheless, Syrian refugees in Jordan still face significant obstacles in accessing basic public services, especially in education and healthcare (Moayerian & Stephenson Jr, 2023). Financial restrictions, regional problems, and experiences of exclusion hinder their capacity to fully use offered resources. In spite of the Jordanian government's initiatives to address the educational needs of refugees through the establishment of schools in camps and educative programs, challenges such as poverty child labor, early marriages, have resulted in elevated dropout rates among Syrian children (Krafft et al., 2022).

In the healthcare sector, despite hypothetical accessibility, real obstacles such as the absence of health insurance, high service fees, and a separate healthcare system provide significant challenges for refugees. The difficulties are worsened by the necessity for right documentation, including valid UNHCR Asylum Seeker Documentations and service cards issued by the Ministry of Interior, which are required for getting subsidized healthcare treatments (Akik et al., 2022).

This study aims to shade light on the diverse experiences of exclusion experienced by Syrian refugees in Jordan regarding accessing educational and healthcare public services; by analyzing personal testimonies of Syrian refugees and current research, it also aims to investigate the resistance techniques utilized by refugees to overcome these challenges. Understanding these dynamics is essential for guiding policies and initiatives that encourage more inclusive access to essential services for refugee populations.

### Literature Review

Refugees' access to essential public services, particularly education and healthcare, has become a considerable issue in host countries. Even though international frameworks like the 1951 Refugee Convention emphasize refugees' right to basic services, the actual circumstances repeatedly uncover a gap between theory and implementation. Scholars and humanitarian entities have steadily highlighted that institutional weaknesses, socioeconomic instability, and legal restrictions hinder refugees' access to education and healthcare services (UNHCR, 2022; REACH, 2021). The refugee crisis in Jordan has put a considerable strain on public services. Nevertheless the generous and admirable initiatives of the Jordanian government, such as the establishment of double-shift schools, hiring extra teachers, and subsidized healthcare programs, numerous studies indicate that a number of refugees encounter discriminatory practices (Human Rights Watch, 2020; Norwegian Refugee Council, 2019). The barriers involve poverty, missing documents, substantial distances to services, limited educational capacity, and complicated registration procedures (Human Rights Watch, 2020).

### Exclusion from Education and Healthcare

Access to school becomes a significant issue for Syrian refugee children, financial hardship is the main reason of school dropouts; as many families rely on their children to increase their household income, and in some cases to be the main breadwinners, resulting in early school dropout. Additionally, educational obstacles encompass inadequate academic assistance, linguistic barriers, and cases of harassment (Salem, 2021).

Bourdieu's (Bourdieu, 1986) cultural capital theory is useful in examining educational disparities. Refugee children are disadvantaged relative to their peers in the host society, because they often lack the cultural capital congruent with the principal educational system, such as linguistic fluency, understanding of academic standards, and family engagement.

When it comes to healthcare, Syrian refugees living in Jordan benefit from subsidized public healthcare; however, the cost of services is an obstacle. According to UNHCR (2022) Only the most disadvantaged refugees get comprehensive coverage or financial aid for health-related costs. The Jordanian healthcare system requires refugees to provide particular documents, including a valid asylum seeker certificate and a Ministry of Interior service card, to obtain the healthcare service, and that can potentially result in delays and denials (CARE International, 2019).

Some studies indicate satisfaction with healthcare quality, while others show that expense, insufficient information, and discrimination towards refugees hinders them from pursuing timely medical treatment (Akik et al., 2022). This unequal access maintains a cycle of vulnerability and exclusion, especially for refugees with chronic diseases or injuries.

**Methodology**

This study explores social exclusion experiences faced by Syrian refugees in Jordan and the techniques they employ to navigate these challenges. The article specifically examines exclusion experiences in education and healthcare, investigating the underlying causes and the strategies taken in response.

A qualitative research methodology was used to provide comprehensive insights into refugees' daily experiences. Data collection was conducted using semi-structured, in-depth interviews, allowing participants to express their opinions and experiences autonomously and in their own language. This method was used to provide a thorough and authentic comprehension of the perception, experience, and resistance to exclusion in daily life.

The fieldwork occurred in Mafraq Governorate in October 2024. Mafraq was chosen because of its large population of Syrian refugees. The sample comprised of 13 Syrian refugees, 10 males involved in self-employment (mostly in industry, agriculture, and commerce) and 3 women who identified as homemakers. The sampling technique employed was snowball sampling, launched via community mediators to seek interested participants. All interviews were performed in person, at participants' residences or workplaces. Interviews ranged from 15 to 25 minutes in duration. Before each interview, participants were apprised of the research's objective, the voluntary aspect of their involvement, and the protocols established to guarantee confidentiality and anonymity. No personal information was gathered, and participants were assigned number codes for the sake of data processing and reporting.

The gathered data underwent descriptive qualitative analysis. The study concentrated on participants' subjective experiences, articulating their viewpoints and highlighting the socio-cultural background of these encounters.

The participants' demographic features are summarised as follows:

• Age: Five individuals were aged 26–35, five were aged 36–45, and three were aged 46–55.

• Marital status: All participants, except for two males, were married and had children.

• Schooling: One participant attained just elementary schooling, two possessed secondary-level degrees, and nine were university graduates or held similar credentials.

• Legal status: All participants possessed temporary protection certificates obtained in Jordan, except for one individual who entered the country using a passport.

• Employment: All male participants were engaged in self-employment within sectors including agriculture, industry, or commerce. Female participants said that they were not involved in paid jobs.

həm də ruhun dərinliklərindəki sirli axtarışların ifadəsinə çevrilir. Sehr və intertekstuallıq isə romanın toxumasında bir-birinə qarışaraq oxucunu tanış dünyanın qeyri-adi çalarlarını kəşf etməyə vadar edir (Fowles, 1982).

Con Faulzun "Mantissa" romanının estetik dəyəri romanda antik yunan, roma və müəyyən mənada xristian dünya duyumunun dərindən araşdırılması ilə müəyyənləşir. İngilis mədəniyyəti isə dini dəyərlərlə yanaşı antik magik dünya duyumunun elementlərinin daşıyıcısı qismində çıxış edir. Deməli, əslində ingilis mədəniyyəti və incəsənəti bir neçə mədəniyyətin timsalında təşəkkül tapmış və magiyanın müxtəlif, rəngarəng xüsusiyyətlərini özündə birləşdirir. Beləliklə, Con Faulzun "Mantissa" əsərindəki mifoloji motivi təhlil edərkən belə bir nəticəyə gəlmək olar ki, sənəti, yaradıcılığı bütöv şəkildə ehtiva etməyə çalışan insan kişi və qadın başlanğıclarını bir-birinə calayır, müxtəlif hadisələri bir-birinin vasitəsiylə izah etmiş olur. Özünün sehr dolu təxəyyülünə qapılan qəhrəman mifoloji dünyadan ibarət magik reallığı həqiqi reallıq kimi qəbul edir, digərlərini də magik reallıqda olan absolyut həqiqətlərə inandırmağa çalışır. Bu cəhətdən "Mantissa" romanı metaforik əsər hesab olunur. Tədqiqatçılar romanda mistik elementləri üzə çıxarır. Mistika özünü həm süjetdə, həm personajların xarakteristikasında, həm də onların münasibətlərində büruzə verir.

Con Faulzda mistifikasiya, elə mətnin daxilində kontekst yaradır və çoxlu substantiv potensiala malik olur. Oxucudan müəyyən şərh bacarıqlarına, assosiativ hərəkətlərə və hissənin bütövlüklə dialektik əlaqəsinə malik olmasını tələb edir. C.Faulzda mistifikasiya, sehrli reallıq nəzərdə tutulduğu kimi aldatma və çaşdırmaq cəhdi deyil, əksinə, həqiqətə gedən yol, xətadan yüksəliş, psixoloji katarsis deməkdir. Bu, bədii texnikanın funksiyalarının belə dəyişməsi dövrümüzün mədəniyyətinin şərti, teatr və oyun məkanının reallıqları ilə təsdiqlənir. Müasir ədəbiyyat məkanında müəllif və oxucu şərik və ya yoldaş kimi görünür, həqiqət axtarışında ortaq bir yol axtarırlar.

Sehr elementləri, mistifikasiya Con Faulzun romanlarında fəlsəfi, psixoloji, detektiv, imitasiya və stilistik xüsusiyyətlər qazanaraq aktiv struktur-semantik valentliyə malikdir. Onun əsərlərində mistifikasiyalarla dolu bədii mətnin semantik məkanının formalaşması göstərilir. Yalnız mövzu və problemlər səviyyəsində mövcud olan mistifikasiya həm də substantiv strukturu müəyyən edir və Faulz mətnlərinin poetikasına təsir edən aktiv obrazlı komponentə çevrilir. Mistifikasiya romanın bədii məkanına qeyri-real elementləri (təsəvvürlər, yuxular, hallüsinasiyalar, proqnozlar və s.), oyun və keçmiş mədəni və tarixi təcrübənin mədəni kodlaşdırılmasını daxil edir. O, əsərin quruluşuna saxtalaşdırma motivlərinin daxil edilməsi texnikası, texnologiyası olmaqla mənanın formalaşması və məna təyini sahəsini genişləndirir. Mistifikasiya roman formasının tərkib hissəsi kimi povestdə dinamizm yaradır və mərkəzi obrazların qurulmasında özünü göstərir (Parodiya, İroniya, Yumor, 2019).

## Nəticə

XX əsr İngilis ədəbiyyatının görkəmli nümayəndəsi Con Faulzun əsərlərini oxuyarkən reallığın itməsinin, absurdun məntiq qanunları üzərində qələbəsini hiss etməmək mümkün deyil. Müəllifin oyun, təxəyyüllə gerçəklik arasındakı sərhədləri silməsi əsərlərinin dramatizmini qabardır. XX əsrdə real dünyabaxışına çevrilmiş ekzistensial mistika Con Faulz ədəbi irsinin fəlsəfi əsasını təşkil edir. İngilis cəmiyyətinin əhval-ruhiyəsinə uyğun gələn bu konsepsiya Faulzun yaradıcılığında fərqli müstəvidən təqdim olunur. Fransız ekzistensiallarının qurduqları "sərhəd sitüasiyalarını" ingilis yazıçısı personajlarının vasitəsiylə dəf edir. Con Faulzun yaradıcılığında mistifikasiya fəlsəfi dünyadərki üçün zəruri mənəvi əhval ruhiyyə yaradır və yaradıcılıq metodu kimi magik realizmin ilkin şəraitini hazırlayır. C.Faulzun əsərlərindəki magik realizm metodunun bədii qaynağı antik yunan miflərinin üzərində formalaşmış müasir ingilis dünya duyumudur. Faulzun yaradıclığında magik realizm metodunun prinsiplərindən istifadə edərək XX əsr ingilis gerçəkliyini müxtəlif rakurslardan rəngarəng bədii vasitələrlə işıqlandırdığı sübuta yetirilmişdir. Postmodern yaradıclığa belə bir yanaşma əsərlərin bütöv mətn kimi xüusiyyətlərini üzə çıxartmaq imkanı verir. Məhz magik realizmin tətbiqi nəticəsində yazıçı XX əsrdə özünün mahiyyət dəyərinin axtarışında olan insanın

ekzistensial-fəlsəfi problemlərinin dərinliklərinə nüfuz edə bilmiş, yaradıcılığının universal cəhətlərini və potensial imkanlarını müəyyən etməyə müvəffəq olmuşdur.

## Ədəbiyyat

1. Mirzəyeva, V. (2019). *Afro-amerikalı yazıçıların yaradıcılığında folklor-mifoloji motivlər və magik realizm problemi.* İpək yolu, №3, 137-145.
2. Belsey, S. (1980). *Critical practice. Text. Kathrin Belsey.* London: Methuen.
3. Connor, S. (1995). *The English novel in history, 1950 to the present*. London.
4. D'Haen, Th. (1983). Text and Reader: A Communicative Approach to Fowles, Barthes, Cortazar and Boon Text. *Th. D'Haen*. Amsterdam, 190.
5. Fowles, J. (2004). *The Magus* Text.: a novel / John Fowles. London: VINTAGE. 658
6. Fowles, J. (1982). *Mantissa.* Little, Brown and Company. New-York, Boston, London.
7. Roh, F. (1927). *Realismo mágico: Problemas de la pintura europea más reciente",* trad. Fernando Vela, en *Revista de Occidente,* 301.
8. Parodiya, İroniya, Yumor. (2019, noyabr 29). https://kulis.az/news/27534 http://www.au.edu.az/upload-files/menu/ipekyolu/2019_3/18MirzeyevaV.pdf

Daxil oldu: 10.12.2024
Qəbul edildi: 15.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/95-99

**Aygün Xudiyeva**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0008-5003-0933
kurdovaygun@gmail.com

# Ədalətli bir cəmiyyət üçün sosial xidmət strategiyaları

**Xülasə**

Cəmiyyətlərin inkişaf səviyyəsi təkcə iqtisadi artımla ölçülə bilməz. Cəmiyyətin rifah səviyyəsi sosial resursların necə bölüşdürülməsi ilə sıx bağlıdır. Resurslar cəmiyyətdə necə bölüşdürülür? Sual sosial ədalət anlayışı ilə sıx bağlıdır. Sosial ədalət və sosial rifah dövlətlərin təminatıdır. Cəmiyyətin tərəqqisi cəmiyyətdə yaşayan bütün insanlardan asılıdır. İnsanların resurslara və xidmətlərə çıxış imkanları bərabərliklə mümkündür. İnsan hüquqları onu diskursdan praktikaya aparan prosesdir. Sosial iş peşəsinin ən mühüm aləti, sosial ədalətdir. Bu araşdırma insan hüquqları və sosial ədalətə əsaslanan sosial iş təcrübələrinin əhəmiyyəti baxımından nəzərə alınacaqdır.

***Açar sözlər:*** *bərabərlik, sosial ədalət, sosial xidmət tətbiqləri*

**Aygun Khudiyeva**
Nakhchivan State University
https://orcid.org/0009-0008-5003-0933
kurdovaygun@gmail.com

# Social Service Strategies for a Fair Society

**Abstract**

The level of development of societies can not be measured only by economic growth. The level of prosperity of a society is closely related to how social resources are distributed. The question of how resources are distributed in society is closely related to the concept of social justice. Social justice, social welfare is the safety of states. The progress of a society is possible if all people living in a society have equal opportunity to access resources and services. Human rights is a process that takes it from discourse to practice. Social justice is the most important instrument of social work profession. This study will focus on the importance of human rights and social justice based social work practices.

***Keywords:*** *equality, social justice, social work practis*

## Giriş

İnsan hüquqları peşəsi olaraq sosial xidmət, cəmiyyətdə xüsusi ehtiyacları olan qruplardakı müraciətçilərin qarşılaşdıqları çətinliklərin öhdəsindən gəlmələrinə kömək edən, müraciətçilərin qarşılanmamış ehtiyaclarını cəmiyyətin resurslarını istifadə edərək hər bir insana insan ləyaqətinə uyğun bir həyat standartına çatdırmağı məqsəd qoyan peşə disiplinidir (Sheafor, Horejsi, 2012). Bir çox disiplin cəmiyyətdəki problemləri izah etməyə və öz sahələrində kömək etməyə çalışır. Sosial xidmət də insanlara yardım edən bir peşədir, lakin onu digər peşələrdən ayıran xüsusiyyət, müraciətçisini dəyişimin obyektindən subyektinə çevirmək və onu yalnız insan olduğu üçün sahib olduğu hüquqlara çatdırmağı hədəfləyən hüquq əsaslı perspektivi ön plana çıxarmaqdır. Sosiologiya, psixologiya kimi bir çox disiplin cəmiyyətdəki funksionallıq problemlərini, uyumsuzluğa səbəb olan amilləri izah etmək üçün nəzəriyyələr inkişaf etdirir. Lakin sosial xidmət, cəmiyyətdəki ədalətsizliyin səbəbini anlamaqdan daha irəli gedərək, müraciətçinin sahib olduğu hüquqlardan istifadə etməsi üçün onun adından müdafiəçilik edir. Bu səbəbdən sosial xidmət cəmiyyətdə ədalətin təmin edilməsində bir zəmanətdir. Sosial xidmət, özünəməxsus bilik, bacarıq

və dəyərlər əsasında müraciətçilərin problemlərini həll etmək və insan inkişafı qabiliyyətlərini artırmaq məqsədi güdür (Serpen, Duyan, Aldoğan, 2014).

**Tədqiqat**

Cəmiyyət, hər biri bir-birindən fərqli xüsusiyyətlərə və ehtiyaclara sahib fərdlərdən ibarətdir. Məqsədləri və ehtiyacları bir-birindən asılı olmayan qruplar üçün tam bərabərlikdən danışmaq mümkün deyil. Buna görə də, bərabərlik anlayışından əvvəl "bərabərsizlik" anlayışının fərqini anlamaq önəmlidir. Eyni olmama vəziyyəti müxtəlif sosial təbəqələrin və ya şəxslərin yaşam şəraitləri arasındakı fərqi ifadə edir. Bu fərq, insanların əsas hüquqlara çatmasında dezavantaj yaradırsa, bu vəziyyət, bərabərsizliyin kənarında bir hüquq pozuntusudur. Qısacası, sosial təbəqələr arasındakı resurslara/fürsətlərə çatmaqda bərabərsizlik, bərabərsiz bir cəmiyyət yaradaraq sosial tarazlığı poza bilər. Bütün fərdlər eyni universal insan hüquqlarına sahib olsa da, hüquqlara çatmaq və onları istifadə etmək gücü arasında bir fərq yaranır, yəni cəmiyyətin resurslarına çatmaqda eyni fürsətə sahib olmamaq vəziyyəti "fürsət bərabərsizliyi" adlanır (Özdemir, 2007). Cəmiyyətdəki bütün fərdlər eyni həyat şəraitinə sahib ola bilməz, buna görə də cəmiyyətdəki bərabərsizlik hər zaman mövcud olacaqdır. Ancaq bu bərabərsizlik nə vaxt ki, fərdlərin həyat şəraitinə müdaxilə edici olur, sahib olduğu fərqlilikdən dolayı sosial bir ayrıma səbəb olur və bu fərqlilik fərdlərin ən əsas hüquqlarına zərər verirsə, burada insan hüquqları pozuntusu baş verir. Sosial islahatçılar bərabərlikçi iddiaları, cəmiyyətin içində müxtəlif qruplara bərabər dəyər verilərək davranılmasını müdafiə edirlər. Halbuki cəmiyyətdəki bütün fərdlər hüquqlara çatmaqda bərabər mövqedə deyillər (Healy, 2009). Cinsiyyət, etnik fərqlilik, əlillik kimi səbəblərdən daha az maaşla işləmək məcburiyyətində qalan insanlara bərabər başlanğıc verməkdən çox, müsbət ayrıcalıq vermək, həqiqi mənada sosial ədalətin təmin olunmasına daha çox töhfə verəcəkdir. Fürsət bərabərliyinə əlavə olaraq, nəticə bərabərliyi də mövcuddur. Bir çox siyasət istehsalçısı, "nəticə bərabərliyi" ilə "fürsət bərabərliyi" arasında fərq qoyur. Nəticə bərabərliyinin hədəf aldığı siyasətlər, insanları bərabər dəyərdə mövqelərə yerləşdirməyi hədəfləyərkən, fürsət bərabərliyi ilə liberal düşüncə qarşısında bir maneə olaraq görülür. Hər iki bərabərlikdə də hədəf, fərdlərə bərabərsiz bir cəmiyyət içində bərabər başlanğıc nöqtələri verməkdir. Qlobal kapitalizmin rifah dövlətləri cəmiyyətlərində getdikcə daha çox hökmranlıq etməsi ilə, praktik bir siyasət hədəfi olaraq nəticə bərabərliyi getdikcə geriləyərkən, bərabərlikçi yanaşmanın əsas praktiki tətbiqi bərabər fürsətlər sahəsində ortaya çıxır. Bu anlayış təhsil, cinsiyyət, əlillik, etniklik kimi sahələrdə qəbul edilmiş sosial ayrılmalarla birbaşa əlaqəlidir (Acar, Negiz, Akman, 2013).

Hüquq hüquqi bir anlayış olmaqla yanaşı, eyni zamanda məsuliyyətdir. Doğuşdan sahib olduğumuz bəzi hüquqların yanında, bəzi öhdəliklər qarşılığında əldə edilən hüquqlar da vardır. Marshall'a görə sosial hüquqlar, fərdin sinif vəziyyətindən asılı olmayaraq, bərabər vətəndaşlıq statusu əsasında müəyyən edilən hüquqlar kimi qəbul edilir. Ancaq bu bərabərlik, cəmiyyətdə mövcud olan bütün fərdlər, xüsusən xüsusi ehtiyacı olan qruplar üçün bir fürsət yaratmır. Bərabər hüquqlardan daha irəli gedərək, xüsusi qruplar üçün sosial dəstək mexanizmləri inkişaf etdirilməli və fürsət bərabərliyi təmin edilməlidir (Buğra, Keyder, 2015).

Sosial xidmət tətbiqləri, cəmiyyətdəki resursları işə salaraq müraciətçilərin sahib olduqları hüquqlara çatmalarına və bu hüquqları istifadə etmələri üçün resurslarla müraciətçiləri bir araya gətirən sistematik tətbiqlər toplusudur. Sağlamlıq və təhsil xidmətlərinə çatmama, ayrı-seçkilik, şiddət, qarşılanmamış əsas ehtiyaclar mikro, mezzo və makro səviyyədəki sosial xidmət tətbiqləri ilə hüquqların yalnız bir bəyanat deyil, həyata keçirilməsinin böyük əhəmiyyəti vardır. Qarşılanmamış hər bir ehtiyac, əslində bir hüququn pozulmasına səbəb olur. Ailə yoxsulluğu səbəbindən təhsilə davam edə bilməyən və işləmək məcburiyyətində qalan bir uşağın təhsil hüququnun pozulmasının arxasında, ailə üzvlərinin işləmək hüququna çatmaması və ya insan həyat səviyyəsinə uyğun gəlməyəcək qədər aşağı bir maaşla işləməsi ola bilər. Bu vəziyyət, kifayət qədər və balanslı qidalanma hüququ, işləmək hüququ və təhsil alma hüququ kimi bir neçə hüquq pozulmasını bir arada daşıyan bir proses ola bilər. Sosial xidmət, ehtiyacı olan hər insanın hüququ olduğunu müdafiə edən hüquq əsaslı tətbiqləri və hüquqları bir-birindən ayrılmaz bir bütöv olaraq nəzərdən keçirməyi, sosial ədalət hədəfini gerçəkləşdirmək məqsədini güdür (Lundy, 2004).

Sosial xidmətin nəticə olaraq hədəfi olan sosial ədaləti reallaşdırmaq istəyində olan sosial xidmət tətbiqçiləri, sosial rifahın istehsal və bölüşdürülməsi mexanizmlərində iştirak edərkən, sosial ədalətin işləməsinə zərər verəcək sosial siyasət və tətbiqlərə qarşı müxalif, tənqidi bir mövqe nümayiş etdirməlidirlər (Tuncay, Erbay, 2006). İnsan hüquqları baxımından, sosial xidmət, qanunlarla təmin edilən hüquqların heç bir ayrım olmadan bütün insanların bu hüquqlardan istifadə etmələri gərəkdiyini müdafiə edir. Hüquq əsaslı yanaşma, cəmiyyətin təminatıdır və cəmiyyətdə mövcud olan bərabərsizlikləri və ədalətsizlikləri, hüquqların gözardı edilməsini aradan qaldırır. Sosial xidmət, uşaq, əlil, qadın, miqrant, yaşlı hüquqları kimi bütün hüquqların istifadəsini, qorunmasını və inkişafını hədəfləyir. İnsan hüquqları, bütün hüquqları və insanları əhatə edən bir üst anlayışdır. Healy'ə görə, insan hüquqları, sadəcə insan olduğumuz üçün sahib olduğumuz hüquqlar olaraq tərif olunmuşdur. Bu səbəbdən, insan hüquqları universaldır. Yaş, cinsiyyət, etnik mənsubiyyət, dini inanclar kimi meyarlardan asılı olmayaraq, hər bir insanın insan ləyaqətinə və onuruna uyğun bir həyat sürə bilməsi fəlsəfəsini daşıyır. Bu hüquqların qorunması və inkişaf etdirilməsi prosesində isə sosial xidmət əsas rol oynayır.

İnsan hüquqları sahəsində çalışan sosial iş mütəxəssisi, müraciətçilərinin hüquqlarını pozulduğunu fərq etdikdə, bu hüquqları müdafiə etmək və onları qorumaq üçün güclü bir müdafiəçi olmalıdır (Barker, 1999).

Sosial xidmətin əsas məqsədi insanların sosial rifahını artırmaq və bütün insanlar üçün ortaq bir rifah sistemində birləşdirməkdir. Cəmiyyətdə dezavantajlı vəziyyətdə olan müraciətçilərin hüquqlarından faydalanmasını təmin etmək üçün bu struktur yalnız sosial dövlət çərçivəsində var ola bilər. Buna görə də, bu tədqiqatda Rawls-ın sosial ədalət düşüncəsi əsas götürüləcəkdir. Sosial ədalət sahəsində əhəmiyyətli tədqiqatlar aparmış John Rawls-a görə, ədalət cəmiyyətin əsasını təşkil edir. Aristotelə görə isə, ədalət fərdlərə orantılı davranış kimi qiymətləndirilir (Craig, 2002).

Rifah dövlətlərində sosial ədalətin təmin olunmasında aşağıdakı meyarlar nəzərə alınır: Yoxsulluğun qarşısının alınması, Təhsildə fürsət bərabərliyinin təmin olunması, Əmək bazarına qatılma, Sosial təhlükəsizlik və sosial yardımların təşkil edilməsi, Rifah və gəlirin yenidən paylanması, Resursların ədalətli bölüşdürülməsi, Ədalətli vergi sistemi.

Sosial xidmət sahəsi də cəmiyyətin dezavantajlı qruplarını hədəf alaraq fərdlərin rifahını artırmağı məqsəd qoyur. Buna görə də sosial xidmət bir sosial hüquqdur. Sosial hüquq, vətəndaşlara dövlətə qarşı yönəldə biləcəkləri tələb hüququ verir. Bu tələb hüququ sahibinin sosial risklər nəticəsində qarşılaşdığı ziyanı aradan qaldırmaq sosial dövlətin vəzifəsidir. İkinci nəsil hüquqlar, iqtisadi, mədəni və sosial hüquqlardır. Bu hüquqlar dövlət tərəfindən qorunmaqla yanaşı, bu hüquqların bütün cəmiyyətə çatdırılması üçün sosial xidmətlərin təşkil edilməsindən də dövlət məsuldur. Sosial hüquqlar, dövlət təşkilatına bir məsuliyyət yükü qoyduğuna görə, pozitiv hüquqlar olaraq qiymətləndirilir (Ethics).

Sosial ədalət, təbiəti etibarilə sosial hüquqları yaradır və iqtisadi və sosial baxımdan zəif olanın qorunmasını nəzərdə tutur. Sosial ədalət anlayışının məqsədi, bir cəmiyyətdə insan onuruna uyğun minimum həyat səviyyəsinin təmin edilməsi bərabərliyidir. Dövlətin yaratdığı siyasətlər və dövlət qurumları vasitəsilə cəmiyyətdə istehsal olunan mal və xidmətlərin paylaşılmasına müdaxilə etməsi və vətəndaşlarına minimum rifah səviyyəsini təmin etməsi lazım olduğu düşünülür. Sosial rifah dövlətinin məqsədi isə əsasən insan onurunun qorunmasıdır və bunu sosial təhlükəsizlik kimi müxtəlif vasitələrlə həyata keçirməyə çalışır (Türk Dil Kurumu).

## Nəticə

Sosial dövlət üçün əhəmiyyətli olan, bölüşdürmədə ədalətin təmin olunması, geniş kütlələrin yaşam səviyyəsinin yüksəldilməsi və beləliklə, insan onurunun qorunmasıdır. Cəmiyyətdəki yoxsul və ehtiyacı olan insanlara dövlət tərəfindən yardım edilməsi, onlara insan onuruna layiq minimum bir həyat səviyyəsinin təmin edilməsi, yəni sosial dövlət prinsipinin həyata keçirilməsi vacibdir. Sosial ədalət fikrinin əsasında balanslı bir gəlir bölgüsü ilə yanaşı, cəmiyyətin resurslarına və

imkanlarına bərabər çıxış təmin edilməsi ideyası durur. Sosial ədalətin təmin edilməsində sosial xidmətin əhəmiyyətli rolu vardır. Çünki insan hüquqları və sosial ədalətin təmin edilməsi sosial xidmət disiplininin əsas dəyərini təşkil edir. Sosial xidmət disiplini, sosial resurslar və xidmətlərin ədalətli şəkildə təqdim edilməsində dövlətin təqdim etdiyi xidmət və siyasətlərin həyata keçirilməsində iştirak edən peşələrdən biridir. Bu şəkildə sosial xidmət ən əsas insan ehtiyacıdır və insan hüquqları, sosial ədaləti təmin etmədə sosial rifah anlayışını vasitə olaraq istifadə edir. Hüquq və azadlıqlar qanunlarla təmin edilmiş olsa da, cəmiyyətdə dezavantajlı qrupların bu xidmətlərdən faydalanması yalnız sosial xidmət müdaxilələri ilə mümkündür. Sosial xidmət mütəxəssisi müraciətçisinə təmin etməli olduğu hər bir ehtiyacı sosial bir hüquq olaraq nəzərə alır. Bir uşağın ailəsi və özünün dolanışığını təmin etmək üçün işləyir olması onu həm sağlam bir mühitdə böyümək hüququndan məhrum edir, həm də ikinci nəsil hüquqları arasında yer alan təhsil hüququnu pozur. Sosial xidmət, uşağın sağlam bir mühitdə böyüməsi və inkişafı üçün lazım olan tənzimləyici tədbirləri almaqla yanaşı, təhsil xidmətlərindən faydalanmasını təmin etmək üçün cəmiyyətin resurslarını hərəkətə keçirməlidir. Bir hüququn pozulması başqa bir hüququn pozulmasına səbəb ola biləcəyinə görə, insan hüquqları bütövlükdə nəzərdən keçirilməlidir. İnsan Hüquqları Ümumdünya Bəyannaməsində də qeyd edildiyi kimi, insan hüquqları ümumi bir bütündür, bölünə bilməz. Bütün insanlar üçün irq, dil, din, məzhəb ayrımı edilmədən, hər kəsin insan ləyaqətinə uyğun bir həyat yaşama haqqı olduğu müqavilədə açıq şəkildə vurğulanmışdır. İnsan hüquqları düşüncəsi bütün mədəniyyətlərdən, millətlərdən və dövlətlərdən yuxarı olan bütün ölkələr üçün əldə edilməli olan ideal bir nizam anlayışını ifadə edir. Bu hüquqların istifadə olunmasında və hüquq pozuntularının qarşısının alınmasında sosial xidmət peşəsi məsuliyyət daşıyır. Nəticə etibarilə, sosial xidmət disiplini insan hüquqları pozuntuları və sosial ədalətsizliklə mübarizə aparmağı tələb edir. İnsan hüquqları və sosial ədalətin təmin edilməsi yalnız effektiv sosial xidmət mexanizmlərinin mövcudluğu ilə mümkündür. Sosial ədalətin təmin edilməsi üçün sosial dövlət və sosial rifah siyasətləri və anlayışı sosial xidmət mütəxəssislərinin əsas istinad nöqtəsi olmalıdır. Sosial xidmət sosial ədaləti həyata keçirərkən üç fərqli yanaşmadan istifadə edir: Gücləndirmə yanaşması, azad edici yanaşma, təzyiqə qarşı tətbiq olunan yanaşmadır. Bu yanaşmalar müraciətçilərin yaşadığı problemlərin daha geniş cəmiyyət strukturundakı bərabərsizliklərdən qaynaqlandığına diqqət yetirərək, cəmiyyətdə dezavantajlı vəziyyətdə olan, təzyiq altında olan müraciətçilərin gücləndirilməsini hədəfləyir. Sosial ədalətin təmin edilməsi və qorunması üçün təzyiqə qarşı tətbiq olunan yanaşma anlayışında sosial xidmət, hüquq pozuntularına uğramış müraciətçilərinə hüquqlarını istifadə edə bilmələri üçün hüquq müdafiəsi edərkən, özünü çox zaman dövlətin içində və bəzən qarşısında da yerləşdirməlidir. Çünki dövlət sosial hüquqları fərdlərə təmin etməklə məsul olsa da, bazar ilə cəmiyyət arasında qaldığı zamanlarda cəmiyyətin adından müdafiə etməli olan peşə işçiləri sosial xidmət mütəxəssisləridir. Sosial xidmət, gücsüz vəziyyətdə olan fərdlərə və qruplara öz həyatları üzərində nəzarət sahibi olmaları üçün onları məlumatlandıraraq və səlahiyyət verərək hüquqlarını müdafiə edən və tələb edən qruplar halına gətirərək sosial ədaləti təmin etməyi hədəfləyir. Nəticə olaraq, sosial xidmət insan ləyaqətini və dəyərini ucaldmaq və sosial ədaləti təmin etmək məqsədi güdən bir disiplin olaraq fəaliyyət göstərir. Bu mənada, sosial ədaləti təmin etmək üçün sosial xidmət bir zərurətdir.

## Ədəbiyyat

1. Acar, H., Negiz, N., Akman, E. (2013). *Sosial siyasət və Dövlət İdarəetmə Komponentləri ilə Sosial İşin Əsasları və Tətbiq Sahələri*. Ankara: Maya Akademiyası
2. Buğra, A., Keyder, Ç. (2015). *Sosial Siyasət Məqalələri*. İstanbul: Əlaqə
3. Barker, R.L. (1999). *The Social Work Dictionary (4th ed.).*Washington DC:NASW Press
4. Craig, G. (2002). Yoxsulluq, Sosial İş və Sosial Ədalət. *British Journal of Social Work*, 32: 669-682.

5. Healy, M.L. (2009). *Sosial İşin Tarixini Tədqiq etmək "İnsan Hüquqları Peşəsi"*. Beynəlxalq Sosial İş. 51(6):735-748.
6. Lundy, C. (2004). *Sosial iş və sosial ədalət.[Elektron Versiya].* Böyük Britaniya. Broadview Press
7. Özdemir, S. (2007). *Qloballaşma prosesində rifah dövləti* [Elektron Nəşr]. İstanbul: İnteqrasiya edilmiş
8. Sheafor, B., Horejsi, C. (2012). *Sosial iş təcrübəsi*. Ankara: Nika nəşriyyatı.
9. Serpen, A.S., Duyan, V., Aldoğan, E. (2014). *Sosial Ədalət Vəkillik Şkalasının Etibarlılıq və Etibarlılıq Tədqiqi.* Cəmiyyət və Sosial Xidmət. 25, 21-34
10. Tuncay, T. və Erbay, E. (2006). *Sosial işin əsasları Onun məqsədi: Sosial Ədalət*. Cəmiyyət və Sosial Xidmət. 17(1). 53-69
11. Ethics. (n.d.). *Code of ethics of the National Association of Social Workers.* National Association of Social Workers. https://www.socialworkers.org/About/Ethics/Code-of-Ethics/Code-of-Ethics-English
12. Türk Dil Kurumu. (n.d.). Sosial ədalət. Cari türkcə lüğət. https://www.tdk.gov.tr/index.php?option=com_gts&arama=gts&kelime=sosyal%20adalet

Daxil oldu: 09.12.2024
Qəbul edildi: 14.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/100-103

**Hüseyn Nağızadə**
Qərbi Kaspi Universiteti
magistrant
https://orcid.org/0009-0001-4867-0623
iamhuseyn02@gmail.com

# Rusiyada 1917-ci il Oktyabr çevrilişi və onun Azərbaycanın siyasi arenasına təsiri

## Xülasə

1917-ci il Rusiya İnqilabı, fevral və oktyabr hadisələri ilə imperiyanın siyasi quruluşunu kökündən dəyişdi. Fevral inqilabı nəticəsində çar II Nikolay devrildi və müvəqqəti hökumət quruldu. Lakin bu hökumət ölkədəki iqtisadi və sosial problemləri həll edə bilmədiyindən, bolşeviklərin rəhbərlik etdiyi Oktyabr İnqilabı baş verdi və Sovet hakimiyyəti formalaşdı. İnqilabın başlıca səbəbləri arasında Rusiyanın Birinci Dünya Müharibəsində ağır məğlubiyyətləri, iqtisadi tənəzzül, ərzaq və yanacaq qıtlığı, kəndlilərin torpaq tələbi və fəhlələrin ağır əmək şəraiti yer alırdı. Müvəqqəti hökumət bu problemləri aradan qaldıra bilmədiyi üçün bolşeviklər "Bütün hakimiyyət Sovetlərə!" şüarı ilə siyasi üstünlük qazandılar. İnqilabın nəticəsi olaraq Sovet Sosialist Respublikaları İttifaqı (SSRİ) quruldu və sosialist ideologiyası rəsmi dövlət siyasətinə çevrildi. Yeni iqtisadi model tətbiq olundu, torpaq kollektivləşdirildi və sənaye dövlət nəzarətinə keçdi. Lakin bu dəyişikliklər uzunmüddətli siyasi repressiyalar və iqtisadi çətinliklərlə müşayiət olundu. Dünya tarixi baxımından Rusiya İnqilabı sosialist hərəkatların güclənməsinə və Qərblə Sovetlər arasında ideoloji qarşıdurmanın başlamasına səbəb oldu. İnqilabın təsirləri 1991-ci ilə qədər davam edən Sovet hakimiyyəti ilə dünya siyasətində mühüm rol oynadı. Məqaləmizdə 1917-ci ildə Rusiyada baş verən Oktyabr çevrilişi və onun Azərbaycanın siyasi arenasına nə kimi təsirlərinin olduğu barədə analiz, təhlil və müqayisə metodlarından istifadə edilməklə tədqiq edilmişdir.

***Açar sözlər:*** *Oktyabr çevrilişi, bolşeviklər, Sovet hakimiyyəti, iqtisadi çətinliklər, sosialist ideologiyası*

**Huseyn Naghizade**
Western Caspian University
Master student
https://orcid.org/0009-0001-4867-0623
iamhuseyn02@gmail.com

# The October 1917 Coup in Russia and its Impact on Azerbaijan's Political Arena

## Abstract

The 1917 Russian revolution radically changed the political structure of the empire with the events of February and October. As a result of the February Revolution, Tsar Nicholas II was overthrown and a provisional government was established. However, as this government failed to solve the economic and social problems in the country, the October Revolution led by the Bolsheviks took place and Soviet power was established. The main causes of the revolution included Russia's heavy defeats in the First World War, economic decline, food and fuel shortages, peasants' need for land and workers' harsh working conditions. Since the provisional government could not solve these problems, the bolsheviks gained political advantage under the slogan “All power to the Soviets!” The revolution led to the creation of the Union of Soviet Socialist Republics (USSR) and socialist ideology became official state policy. A new economic model was introduced, land was collectivized and industry was brought under state control. But these changes were

 

accompanied by prolonged political repression and economic hardship. In terms of world history, the Russian revolution led to the strengthening of socialist movements and the beginning of an ideological conflict between the West and the Soviet Union. The consequences of the revolution played an important role in world politics under Soviet rule, which lasted until 1991. In our article, the October 1917 coup that took place in Russia and its impact on the political arena of Azerbaijan are analyzed using the methods of analysis, and comparison.

***Keywords:*** *October coup, bolsheviks, Soviet power, economic difficulties, socialist ideology*

## Giriş

1917-ci ilin Oktyabr çevrilişi, yalnız Rusiya İmperiyasının siyasi və sosial quruluşunu dəyişdirməklə qalmamış, həmçinin dünya tarixində əhəmiyyətli bir dönüş nöqtəsi olmuşdur. Bu çevriliş, uzun müddət davam edən siyasi və iqtisadi böhranların nəticəsi olaraq, çarizm rejiminin sona çatmasına və Sovet hakimiyyətinin formalaşmasına zəmin yaratmışdır. Birinci Dünya Müharibəsinin ağır nəticələri, daxili iqtisadi tənəzzül, sosial narazılıqlar, fəhlə və kəndli siniflərinin inqilabi əhval-ruhiyyəsi, Oktyabr çevrilişinin baş verməsində başlıca amillərdən idi. Bu prosesin nəticəsi olaraq, Sovet Sosialist Respublikaları İttifaqının (SSRİ) yaranması ilə yeni bir siyasi və iqtisadi sistemin əsasları qoyulmuş, sosializm ideologiyası dövlətin rəsmi siyasətinə çevrilmişdir. Oktyabr çevrilişinin təsirləri yalnız Rusiyada deyil, həmçinin imperiyanın tərkibindəki müxtəlif xalqların siyasi həyatına da böyük təsir göstərmişdir (Kaspi, 1917). Azərbaycan, öz tarixi və coğrafi mövqeyinə görə bu dəyişikliklərin mərkəzində yer almış və Sovet hakimiyyətinin tətbiqi ilə qarşılaşmışdır. Bu məqalə, Rusiyada baş vermiş Oktyabr çevrilişinin Azərbaycanın siyasi arenasına təsirini, bolşevik ideologiyasının və Sovet hakimiyyətinin Azərbaycan cəmiyyətinə təsirini elmi əsaslarla araşdırmağı hədəfləyir. Məqsədimiz, bu tarixi prosesin Azərbaycan siyasi düşüncəsi və müstəqillik mübarizəsi üzərindəki uzunmüddətli təsirlərini detallı şəkildə təhlil edərək, bu dövrün mahiyyətini və nəticələrini dərinləşdirməkdir (Figes, 2008).

**Tədqiqat**

David Lane qeyd edir ki, Stefan Zweigın “Tarixdə həlledici məqamlar” kitabında 1917-ci ilin oktyabrında Leninin Rusiyaya qayıdışını dünya tarixinin ən önəmli üç "an"ından biri kimi qiymətləndirir. Digər iki hadisə isə 1453-cü ildə Konstantinopolun süqutu və 1815-ci ildə Napaleonun məğlubiyyətidir (Lane).

1917-ci ilin Fevral İnqilabı, artan korrupsiya, çarın geridəqalmış siyasəti və Birinci Dünya Müharibəsindəki ağır itkilər nəticəsində baş verdi. Petroqradda ərzaq qıtlığına görə başlayan iğtişaşlar sürətlə yayıldı, ordunun üsyançılara qoşulması Çar II Nikolayın taxtdan imtina etməsinə səbəb oldu. Müvəqqəti hökumət quruldu, amma Petroqrad Soveti və fəhlə sovetləri buna qarşı çıxdı. İyulda Aleksandr Kerenski hökuməti idarə etməyə başladı, amma Kornilovun çevriliş cəhdi və xaos vəziyyəti daha da gərginləşdirdi. Sentyabrda bolşeviklər Petroqrad və Moskva sovetlərində üstünlük qazandılar (Encyclopaedia Britannica, 2025). 1917-ci ilin 25 oktyabrında (7 noyabr) Qırmızı Mühafizəçilər, çoxluq zavod işçiləri ilə şəhərin mühüm yerlərini tutaraq Qış Sarayına yürüş etdilər və müvəqqəti hökumət müqavimət göstərmədən devrildi (Hallett, 2015, s. 60). Rusiyada oktyabr inqilabının əsas səbəbi vətəndaş cəmiyyətinin olmamasıdır. Antonio Gramsci 1920-ci ildə yazdığı "vətəndaş cəmiyyəti" konsepsiyasında Qərb cəmiyyətlərinin Rusiyadan daha mürəkkəb olduğunu vurğulayaraq, onların inqilabla çökə bilməyəcəyini qeyd etmişdir (Antonio, 2003, s. 36). David Lane, Oktyabr İnqilabının uzunmüddətli amilləri arasında kəndli yoxsulluğu, torpaq azlığı, pis həyat şəraiti və sənaye işçilərinin aşağı əmək haqqını qeyd edir. O, inqilabın üç ziddiyyətli mövqeyini təqdim edir: 1) İyerarxik iqtisadiyyatın mülkiyyət olmadan işləyə biləcəyini, lakin səmərəliliyinin azaldığını; 2) Siniflərin ləğvi və iqtisadi bərabərsizlikləri tam aradan qaldırmamasını; 3) Demokratiyanın gücləndirildiyini iddia etsə də, bürokratik nəzarətin qalması və geniş iştirakçılıq mədəniyyətinin gerçəkləşməməsini vurğulayır (Lane).

Oktyabr çevrilişi Cənubi Qafqaza, xüsusən Azərbaycana təsir göstərdi, amma hadisələrin saxtalaşdırılması səbəbindən uzun müddət Azərbaycanın tarixindəki rolunu obyektiv dəyərləndirmək çətin olmuşdur (Balayev, 2022, s. 138). Oktyabr çevrilişinə Azərbaycanın

yanaşması bəzən yanlış anlaşılmışdır. “Müsavat” partiyası, bolşevikləri deyil, Müvəqqəti hökumətin devrilməsini dəstəkləyirdi. 1917-ci ilin 7 noyabr qətnaməsində partiya, Müvəqqəti hökumətin xarici siyasətini və milli məsələlərə münasibətini tənqid edərək, onun süqutunun qaçılmaz olduğunu vurğulamışdır. (Bakinskiy rabochiy, 1917). Burada gördüyünüz kimi, bolşevikpərəst mövqedən söz getmir. Baxdığımız zaman, Azərbaycanın XX əsr tarixinin obyektiv cəhətdən araşdırılmasında böyük xidmətləri olan T.Svetoxovski və F.Kazımzadənin bu məsələ ilə bağlı yönəlimi doğruluq cəhətdən yetərli olmur. Onlar bolşeviklərin oktyabr çevrilişindən sonrakı qərarlarının müsavatçılara həddindən artıq təsirindən yazır. Məsələ məhz 1917-ci il 2 noyabr tarixindəki “Rusiya xalqlarının hüquq Bəyannaməsi”ndən gedir (Dekreti Sovetskoy vlasti, 1957, s. 40). Bu prinsiplər “Müsavat”ın strategiyasına heç bir real təsir göstərmədi. T.Svetoxovski'nin “Müsavat” liderlərinin bolşeviklərin şüarını milli muxtariyyətin həlli kimi qəbul etməsi fikri ziddiyyətlidir (Swietochowski, 1988, p. 37). Həmçinin F.Kazımzadənin bu məsələdə eyni mövqedən çıxış etməsi də, düzgün deyil (Kazemzadeh, 1951). Aydın Balayevə görə, oktyabr çevrilişindən sonra bolşeviklər, xüsusilə Azərbaycanda, yerli əhalidən dəstək ala bilmədikləri üçün vəziyyətləri çətin idi. Onların sosial dayağı zəif idi, əsas dəstəyi isə rus ordusunun radikallaşmış əsgərləri və Bakıdakı rus və erməni fəhlələri təşkil edirdi (Balayev, 2022, s. 142). 1917-ci ilin oktyabrında Bakı Şəhər Dumasına keçirilən seçkilərdə əsgərlərin 90%-i bolşeviklərə səs versə də, mülki əhali arasında dəstək yalnız 15,4% idi, bu da bolşeviklərin əsas dayağının ordudakı radikal əsgərlər olduğunu göstərirdi (Belenkiy, Manvelov, 1927, s. 181). 1917-ci ilin oktyabrının 27-də Bakıda keçirilən toplantıda müxtəlif siyasi partiyalar İctimai Təhlükəsizlik Komitəsinin yaradılmasına qərar verdilər. Komitə bolşevik çevrilişini "cinayətkar qiyam" adlandıraraq, Bakıda qanlı qarşıdurmalara yol verməyəcəklərini bəyan etdi və şəhərin bolşeviklərin hökmü altına düşməyəcəyini vurğuladı (Belenkiy, Manvelov, 1927, s. 194). Oktyabrın 31-də Bakı Soveti iclasında menşeviklər, eserlər və daşnaklar etiraz edib iclası tərk etdilər, bu da bolşeviklərə hakimiyyəti ələ keçirmək imkanı verdi. Yeni rəhbərlik formalaşdırılıb, əsas vəzifələr, o cümlədən İcraiyyə Komitəsinin sədri postu bolşeviklərə verildi (Ratqauzer, 1927).

Bakı Sovetinin qərarından sonra şəhərdə üç fərqli qurum hakimiyyət iddiası ilə çıxış etdi: menşeviklər, eserlər və daşnakların rəhbərlik etdiyi İctimai Təhlükəsizlik Komitəsi, bolşeviklərin nəzarətindəki Bakı Soveti və Şəhər Duması. Hər biri legitimlik iddiası irəli sürsə də, heç biri cəmiyyətin tam dəstəyini qazana bilmədi, bu da şəhərdə xaotik vəziyyətə səbəb oldu (Belenkiy, Manvelov, 1927, s. 181). Bakıdakı siyasi qarışıqlıqda, bolşeviklər Şəhər Dumasını buraxmamağı seçdilər. Duma kütlələr arasında nüfuzlu olmasa da, iqtisadi güclərin təmsilçisi idi. Bolşeviklər, Dumanı qorumaqla şəhər təsərrüfatını idarə etməyə davam edərək, sosial partlayışın qarşısını almaq məqsədini güdürdülər. Bu, iqtisadi və siyasi xaosun məsuliyyətini tam üzərlərinə götürməmək üçün praqmatik bir addım idi (Baberovski, 2003).

Bolşeviklər, Şəhər Dumasını İctimai Təhlükəsizlik Komitəsini zəiflətmək üçün istifadə etdilər. S.Şaumyan, Dumanın mövcudluğunu Komitənin funksiyasız olduğunu göstərən bir arqument kimi təqdim etdi. Bolşeviklər, Dumanı demokratik bir qurum olaraq, rəqiblərini qanuni yolla sıradan çıxarmağa çalışırdılar (İzvestiya Bakinskovo Soveta, 1917). 1917-ci ilin sonunda "Müsavat" partiyası Bakıda hakimiyyət uğrunda mübarizə aparan İctimai Təhlükəsizlik Komitəsi və Bakı Soveti arasında çətin bir seçim qarşısında qaldı. Hər iki qurum milli hərəkatın maraqlarına zidd mövqedə idi. Komitə menşeviklər, eserlər və daşnaklardan ibarət olub, Azərbaycan milli hərəkatını dəstəkləmirdi; Bakı Soveti isə bolşeviklərin nəzarətində idi və milli tələbləri rədd edirdi. "Müsavat" partiyası, hər iki variantın milli hərəkat üçün təhlükə olduğunu görərək, Komitənin fəaliyyətindən kənarda qalmağa qərar verdi. Bu, partiyanın ideoloji müstəqilliyini qorumağa və bolşeviklərlə mümkün yaxınlaşmanı açıq saxlamasına imkan verdi. Nəticədə, bu qərar İctimai Təhlükəsizlik Komitəsinin nüfuzunun sarsılmasına və "Müsavat"ın daha güclü siyasi mövqe qazanmasına səbəb oldu (Swietochowski, 1988).

## Nəticə

Rusiya inqilabları və vətəndaş müharibələri mövzusunda bir çox geniş tədqiqatlar aparılmış və bu sahədə çoxsaylı kitablar yazılmışdır. Zamanla yeni araşdırmalar ortaya çıxsa da, hadisələrin şərhi və dəyərləndirilməsi müxtəlif yanaşmalarla qiymətləndirilir. Sovet Rusiyasının tarixi xüsusilə diqqətlə və həssas şəkildə araşdırılmalıdır, çünki Stalin və ondan sonrakı hakimiyyətlər bu dövrü öz ideologiyalarına uyğun olaraq yenidən işləyib, kommunist rejimini "qanuniləşdirmək" üçün istifadə ediblər. 1928-1953-cü illərdə Stalinə qarşı güclü tənqidlər və sərt ittihamlar səsləndirilmişdir. Oktyabr çevrilişi, Rusiyada və onun tərkibindəki digər ölkələrdə, o cümlədən Azərbaycanda dərin sosial və siyasi təsirlər yaratmışdır. Azərbaycanın tarixindəki bu dövrün obyektiv dəyərləndirilməsi, həm bolşeviklərin, həm də müstəqil Azərbaycan milli hərəkatının maraqlarını düzgün şəkildə qiymətləndirmək zərurətini ortaya qoyur. Müsavatın siyasi müstəqilliyini qorumaq və həm bolşeviklərə, həm də Müvəqqəti Hökumətə qarşı mübarizə aparmaq qərarı, Azərbaycanın gələcək müstəqillik və milli hərəkat istiqamətindəki mübarizəsi üçün vacib bir addım idi. Bu dövrün düzgün başa düşülməsi, yalnız tarixi hadisələrin deyil, həm də Azərbaycanın siyasi düşüncə tarixinin və müstəqillik hərəkatının formalaşmasının açarını təşkil edir.

## Ədəbiyyat

1. Antonio, G. (2003). *Vətəndaş Cəmiyyəti*.
2. Baberovski, Y. (2003). *Düşmən hər yerdədir (Stalinizm Qafqazda).* Alatoran Nəşriyyatı.
3. Bakinskiy rabochiy. (1917). № 82.
4. Belenkiy, S., Manvelov, A. (1927). *Revoluchiya 1917 goda v Azerbaydzhane (xronika sobitiy).* https://research.sociology.cam.ac.uk/news/perceptions-russian-october-revolution-great-britain
5. Dekreti Sovetskoy vlasti. (1957).
6. Encyclopaedia Britannica. (2025). *The February Revolution*. https://www.britannica.com/event/Russian-Revolution/The-February-Revolution
7. Figes, O. (2008). *Die Tragodie eines Volkes.*
8. Hallett, E. (2015). *Lenindən Stalinə qədər rus inqilabı, 1917-1929*.
9. Kaspi. (1917). №117.
10. Kazamzadeh, F. (1951). *The struggle for Transcaucasia (1917-1920)*.
11. Lane, D. *Perceptions Of The Russian October Revolution In The Great Britain*.
12. Ratqauzer, Y. (1927). *Bakıda inqilab və vətəndaş müharibəsi*.
13. Swietochowski, T. (1988). *From Muslim Community to National Identity. Russian Azerbaijan 1905-1920.*

Daxil oldu: 08.12.2024
Qəbul edildi: 13.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/104-107

**Zümrüd Qasımova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
https://orcid.org/0009-0001-3458-7941
zumrud.vahid@mail.ru

# Don Delillo və David Foster Wallace əsərlərində ekzistensializm və postmodernizm: informasiya xaosunda insanın mənasızlıq axtarışı

## Xülasə

XIX əsrin ikinci yarısından etibarən fəlsəfənin bir çox sahələri fərdiyyətçilikdən ümumbəşəri biliyə, hər kəs üçün eyni olan məzmun və həqiqəti tapmaq cəhdlərinə doğru irəliləyirdi. Həmin tarixi dövrlərdə bütün universal qanunlar insanın mahiyyətini aşkara çıxarmaq üçün istifadə edilirdi. Məlum olduğu kimi, XIX əsrin ortalarına qədər fəlsəfədə rasionalizm ideyaları üstünlük təşkil edirdi. Lakin bu işdə müəyyən çətinliklər də özünü göstərmişdir. Nəticədə fəlsəfi fikrin bir sıra formalarından narazılıq özünü göstərmiş, bir sözlə desək alimlər arasında "fəlsəfi qiyam" başlanmışdır. Həmin "fəlsəfi qiyam"ın nümayəndələri sonradan ekzistensializm fəlsəfəsini yaratmışlar. Ekzistensialistlərin irəli sürdükləri əsas ümumi problem həyatın mənası, insanın dünyada yeri və onun özünə həyat yolu seçməsi məsələsini aydınlaşdırmaqdan ibarətdir.

Postmodernizm isə modernizmdən sonra yaranmış yeni dünyagörüşləri və həyata baxışları yeni məzmunda ehtiva edirdi. Əslində isə postmodernizm, bir növ modernizmin "qalıq effektləri" ilə işləyən təkrar təfəkkür modeli kimi gündəmə gəlmişdi və onun bütün fəaliyyət sahələrində poststrukturalizmin əsas əlamətləri müşahidə olunurdu. Poststrukturalizm postmodernizmi modern təfəkkür tərzi kimi təqdim edirdi. Təqdim olunmmuş məqalədə Don Delillo və David Foster Wallace əsərlərində ekzistensializm və postmodernizm: informasiya xaosunda insanın mənasızlıq axtarışı probleminə münasibəti araşdırılmışdır.

***Açar sözlər:*** *fəlsəfi cərəyanlar, ekzistensializm, modernizm, postmodernizm, ədəbi cərəyanlar*

**Zumrud Gasimova**
Azerbaijan State Oil and Industry University
https://orcid.org/0009-0001-3458-7941
zumrud.vahid@mail.ru

# Existentialism and Postmodernism in the Works of Don Delillo and David Foster Wallace: The Search for Meaninglessness in the Chaos of Information

## Abstract

From the second half of the 19th century onward, many branches of philosophy shifted from individualism toward the pursuit of universal knowledge, seeking content and truth that would be the same for everyone. During this historical period, all universal laws were employed to uncover the essence of human nature. As it is known, until the mid-19th century, rationalist ideas dominated philosophy. However, certain difficulties arose in this endeavor. Consequently, dissatisfaction with various forms of philosophical thought emerged, leading to what could be described as a "philosophical rebellion" among scholars. The representatives of this "philosophical rebellion" later laid the foundation for existentialist philosophy.The primary issue raised by existentialists was to clarify the meaning of life, the place of human beings in the world, and the process of choosing one's own path in life.

Postmodernism, in turn, encompassed new worldviews and perspectives on life that emerged after modernism. In essence, postmodernism surfaced as a kind of repetitive thought model that operated with the "residual effects" of modernism, and poststructuralist characteristics were

 

observed in all its spheres of activity. Poststructuralism presented postmodernism as a mode of modern thought.

The presented article examines the perspectives of existentialism and postmodernism in the works of Don DeLillo and David Foster Wallace, specifically focusing on the problem of searching for meaninglessness in the chaos of information.

***Keywords:*** *Philosophical movements, existentialism, modernism, postmodernism, literary movements*

## Giriş

**Ekzistensializm və Postmodernizmin mahiyyəti.** Ekzistensializmin cərəyanının banisi XIX əsrin birinci yarısında yaşamış alman filosofu Haydeggerdir (1889-1976). Ekzistensializm cərəyanı insanın mövcudluq problemini yeni baxış bucağından təqdim edir. İnsan öz qısa ömründə, fərdi həyatında kimdir və necədir kimi suallarını aydınlaşdırmağa çalışır. Bu fəlsəfənin tərəfdarları onu, ümumiyyətlə, varlıq haqqında təlim kimi təqdim edirlər.

Bildiyimiz kimi, postmodernism XX əsrdə meydana çıxan fəlsəfi istiqamətdir və bu ifadə ilk dəfə 1917-ci ildə alman filosofu Rudolf Panviz tərəfindən müəllifi olduğu "Avropa mədəniyyətinin böhranı" əsərində istifadə olunub. Postmodernizm anlayışı mübahisəlidir: ədəbiyyat, memarlıq, rəssamlıq, musiqi, rəqqaslıq, psixoanaliz, teologiya, tarix, fəlsəfə kimi fərqli sahələrdə istifadə edilir (Əsədova, 2012, s. 7).

**Problemə dair Don DeLillo və David Foster Wallace yaradıcılığı.** David Foster Wallace ekzistensialist cərəyanın tərəfdarı idi. O, ekzistensializmi neoliberalizmin həlli kimi təklif edir, lakin neoliberalizm ekzistensializmin sosial konkretləşdirilməsidir. David Foster Wallace əsərləri tez-tez bu cür mübarizələrə yönəldiyi və onun oxşar daxili mübarizələri ilə nəticələndiyi üçün, onun yaradıcılığı çox vaxt tamamilə pessimist kimi yanlış qəbul edilir. Wallace əsərlərinə dair bu yanlış şərhlərin ekzistensializmin klassik yanlış şərhi ilə paralel getməsi təsadüfi deyil. Bir çoxları ekzistensializmi qaranlıq, kədərli və ümidsiz bir fəlsəfə kimi qəbul edirdilər. Lakin biz tədqiqatımızda aydınlaşdırmışıq ki, ekzistensializm, əslində, əvvəllər düşünüləndən daha pozitiv bir fəlsəfədir, çünki o, öz mahiyyətində autentikliklə nəticələnir ki, bu da inkarolunmaz şəkildə müsbət bir nəticədir. Eyni zamanda, Wallace yazıları da ilkin baxışda göründüyündən daha nikbin bir baxış bucağına malikdir. Həqiqətən də, Wallace depressiyaya təslim olsa da, onun fəlsəfəsi depressiv deyil və bəzi baxımlardan ondan əvvəlki ekzistensialistlərin təklif etdiklərindən daha ümidverici bir ekzistensial mövqe sərgiləyir (Qanun, 2008).

**Tədqiqat**

Wallace əsərləri ekzistensial fəlsəfəni – xüsusilə Sartrın ekzistensializmini nümayiş etdirir və eyni zamanda bu mövzuları iki əsas istiqamətdə inkişaf etdirir (Primak, 2020, s. 5). Birincisi, o, ekzistensial suallar içində olan, ekzistensial dilemmlərlə üzləşən və ekzistensial xüsusiyyətlərə sahib personajlar yaradır . İkincisi, Wallacein ekzistensial baxımdan mürəkkəb personajları bəzi ilkin Sartr ekzistensialist ideyalarına – xüsusilə qeyri-səmimilik (bad faith), Digəri (the Other) və autentiklik anlayışlarına – daha dərindən yanaşaraq onların fəlsəfi aspektlərini inkişaf etdirir (Waham, 2023).

Xüsusilə qeyd etmək lazımdır ki, Wallacein bədii yaradıcılığı ekzistensial fəlsəfəni inkişaf etdirir, çünki o, qeyri-səmimiliklə mübarizə aparan və ya autentiklik axtarışında olan fərdlərin çətinliklərini təsvir etməklə, bu cür məqsədlərə çatmağın həm çətinliyini, həm də son nəticədə dəyərli olduğunu vurğulayır. David Foster Wallace yaradıcılığını anlamaq üçün vacib kontekstlərdən biri də postmodernizmdir. Postmodernizm çox müxtəlif mənalar kəsb etsə də, Wallacein yaradıcılığını başa düşmək üçün iki əsas cəhəti nəzərə almaq lazımdır (Dadaşov, 2014).

Birincisi, Wallace özünü amerikalı bir yazıçı kimi görürdü və Amerika ədəbi ənənəsi çərçivəsində yazırdı. 1950-1960-cı illərdə Amerikan ədəbiyyatında yeni bir istiqamət formalaşdı; bu cərəyan ironiya, kollaj, qeyri-xətti süjet və qeyri-funksional formalardan – məsələn, özünə istinad və metafiksiyadan geniş istifadə edirdi (Əsədova, 2012).

Don DeLillo'ya 1980-ci illərin ortalarında başlanğıcda göstərilən böyük marağın və onun White Noise (1985) əsərinin müharibədən sonrakı dövrün ən çox tədris olunan romanlarından birinə çevrilməsinin səbəbi DeLillo-nun Amerika ədəbiyyatında postmodernizmə keçidi təmsil edən yazıçı kimi qəbul edilməsidir. Lakin əsas sual budur: DeLillo hansı mənada postmodern yazıçıdır? Onun postmodernliyə aid edilməsi müasir Qərb və bəlkə də xüsusi olaraq Amerika həyatının media doymasının və qloballaşmış sərbəst bazar kapitalizminin hökm sürdüyü dövrdə antropoloji baxımdan detallı təsvirinə görədir? Yoxsa onun müəyyən üslubi texnikalardan istifadə edərək postmodernizm adlanan yeni bədii ifadə üsulunun nümayəndəsinə çevrilməsinə görədir? Yaxud da onu çağdaş iqtisadi və siyasi meyillərə qarşı çıxan, postmodernizmi tərəddüdlə qəbul edən, amma eyni zamanda ona müəyyən qədər qarşı duran bir yazıçı kimi görmək olarmı (Quliyev, 2006)?

DeLillo-nun oxucularını ən çox maraqlandıran əsas müzakirə onun təsvir etdiyi mədəniyyətdən tənqidi məsafə saxlaya bilib-bilməməsi ilə bağlıdır. Sadə dillə desək, onun yazıları postmodern vəziyyətin bir simptomu, diaqnozu, yoxsa təsdiqi kimi qiymətləndirilə bilər?

Modernizmdən sonra DeLillo-nun Ceyms Coys və Uilyam Folkner kimi modernist yazıçılara, eləcə də kinomontaj və ədəbi sürrealizm kimi bədii texnikalara olan marağını araşdıran tənqidçilər onun XX əsrin əvvəllərindəki avanqard cərəyanları ilə və ümumiyyətlə, modernizmlə digər müasir postmodernist yazıçılardan daha çox formal və ruhani yaxınlığı olduğunu iddia etməkdə haqlıdırlar. Lakin burada bir ironiya var: DeLillo-nun modernizmə olan böyük borcunu açıq şəkildə etiraf etməsi nəticədə onu postmodern baxışından təqdim edirdi (Hacıyeva, 2014).

Don DeLillo-nun White Noise əsəri postmodern ədəbiyyatın klassik nümunələrindən biri hesab olunur və eksperimental üslubu, istehlakçılıq, ailə institutunun dağılması kimi mövzulara toxunması ilə seçilir (Giligan, 2023, s. 180). Bu parçadakı postmodernizmin əsas xüsusiyyətlərindən biri müxtəlif üslub və janrların ironiya və oyuna əsaslanan şəkildə birləşdirilməsindən istifadə edilməsidir.

Roman boyunca DeLillo reallıq və uydurma arasındakı sərhədləri qeyri-müəyyənləşdirir və personajlarını tez-tez mediaya əsaslanan bir dünyada yaşadıqlarının fərqində olan fərdlər kimi təsvir edir. Bununla o, istehlak mədəniyyətinin və kütləvi medianın reallıq qavrayışımıza təsirini tənqid edir. Bu, postmodern ədəbiyyatın əsas mövzularından biridir. Romanda yer alan yumor və ironiya elementləri, postmodernizmin ənənəvi gözləntiləri alt-üst etməyə yönəlmiş oyunbaz və eksperimental yanaşmasını əks etdirir. Həmçinin, postmodernizm fraqmentasiya, yəni müxtəlif mədəni və dil sistemlərinin dağılması və yenidən qurulması ilə maraqlandığından, romanın strukturu da bu xüsusiyyəti nümayiş etdirir.

Don DeLillo öz əsərlərində insanın mənasızlıq axtarışını, eksiztensial tənhalığını və postmodern cəmiyyətin təsirlərini dərin şəkildə araşdırır (Ruphavati, 2024, s. 1294). Xüsusilə White Noise və Mao II romanlarında bu mövzular aydın şəkildə görünür. Ümumiyyətlə, Don DeLillo-nun White Noise romanı postmodern ədəbiyyatın əsas xüsusiyyətlərindən bir neçəsini özündə cəmləşdirir. Bunlara pastiş üslubu, media və istehlakçılığın təsirlərinin araşdırılması, eləcə də qeyri-sabitlik və fraqmentasiyaya diqqət yetirilməsi daxildir (Tayebi, 2015).

DeLillo postmodernizmin əsas xüsusiyyətlərindən biri olan reallığın parçalanmasını və mediatik təsirin güclənməsini öz əsərlərində ustalıqla göstərir.White Noise romanında televiziya, reklam və informasiya axını gündəlik həyatın əsas elementinə çevrilir. İnsanlar öz həqiqi duyğularından uzaqlaşır, reklamlar, mediadan gələn "ağ səs" onların düşüncələrinə hakim kəsilir. Burada postmodernizmin əsas ideyalarından biri olan hiperreallıq anlayışı aydın görünür.

Mao II romanında isə terrorizm və media qarşılıqlı əlaqədə təqdim edilir. Postmodern dövrdə fərdi hekayələr yox, kütləvi hadisələr dominant olur. Burada Jean Baudrillard-ın simulyasiya konsepsiyasına yaxın bir fikir formalaşır – media hadisələri elə dəyişdirir ki, gerçəkliyi manipulyasiya edir və insanlar həqiqi hadisələrə deyil, onların medialardakı əksinə reaksiya verirlər. Mao II isə sənət və fərdi kimlik üzərində dayanır. Burada müəllif terror, kütləvi informasiya və fərdin itməsi kimi mövzuları önə çıxarır. Baş qəhrəman Bill Gray, bir yazıçı olaraq, özünün və sənətinin rolunu sorğulayır, cəmiyyətin gözündə fərdi yaradıcılığın dəyərsizləşməsini hiss edir. Bu, eksiztensialist baxımdan insanın öz azadlığını və unikal varlığını dərk etməyə çalışmasını əks etdirir (Zeynalova, 2015).

## Nəticə

Don DeLillo White Noise və Mao II əsərlərində eksiztensializmin və postmodernizmin əsas mövzularını birləşdirərək müasir insanın mənasızlıq axtarışını təsvir edir. Onun personajları texnologiya, media və informasiya xaosunun içində mənalarını itirir, ancaq eyni zamanda öz varlıqlarının dərinliyini anlamağa çalışırlar. Bu baxımdan DeLillo postmodern dövrdə insanın tənhalığını və reallıqla əlaqəsinin qırılmasını həm fəlsəfi, həm də sosial kontekstlərdə araşdırır.

## Ədəbiyyat

1. Dadaşov, A. (2014). *Postmodernizm modernizmin inkar kontekstində*. Ulduz, (4), 64-71.
2. Əsədova, A. (2012, sentyabr 19). *Postmodernizm – ədəbiyyatlaşan dünya*. 525-ci qəzet, 7.
3. Əsədova, A. (2012, sentyabr 27). *Postmodernizm – müasir dövrün intellektual və emosional ifadəsi*. 525-ci qəzet, 7.
4. Gilligan, M. (2023). *White noise: Life in a postmodern world. American Affairs*, 7(1), 177–185.
5. Hacıyeva, M. (2014). Postmodernizm dövründə multimədəni mühitdə dəyişən sərhəd anlayışı. *Filologiya məsələləri*, (9), 268–272.
6. Primak, S. (Tərtibçi). (2020). *The existential philosophy of David Foster Wallace*. Bridgewater State University.
7. Qanun. (2008). *Umberto Eko və postmodernizm fəlsəfəsi*. Bakı: Qanun.
8. Quliyev, T.Ə. (Tərtibçi). (2006). Ədəbiyyatda realizm və modernizm problemləri. Bakı: Nağıl.
9. Ruphavati, G. (2024). Healing the self: Mental health and existential recovery in the select works of Don DeLillo. *South Eastern European Journal of Public Health* (SEEJPH), 25(S1), 1293–1299.
10. Tayebi, S. (Tərtibçi). (2015). Reinstating reality: David Foster Wallace’s short stories: A reading according to Jean Baudrillard. *The International Journal of Baudrillard Studies*, 12(2). http://www.ubishops.ca/baudrillardstudies/
11. Waham, J.J. (2023). Postmodernism and metafiction in David Foster Wallace's novel Infinite Jest. *Eastern Journal of Languages, Linguistics and Literatures*, 1.
12. Zeynalova, D. (Tərtibçi). (2015). *Modernizm, postmodernizm*. Bakı: Elm və təhsil.

Daxil oldu: 09.12.2024
Qəbul edildi: 16.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/108-111

**Aysel İbrahimova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
https://orcid.org/0009-0009-7321-7159
aysel-ibrahimova2015@mail.ru

# Xarici dilin tədrisində yeni sözlərin öyrənilməsi zamanı şifahi xalq ədəbiyyatından istifadə və onların motivasiyaya təsiri

### Xülasə

İnsan həyatında motivasiyanın əhəmiyyətli rolu vardır. Arzulamaq və bu arzuları reallaşdıran zaman səy göstərmək üçün önəmli faktor - motivasiyadır. Motivasiya məna, məqsəd və yaşamağa doğru səy göstərməyə davam etmək istəyidir. Eyni zamanda motivasiya məqsədyönlü davranışları başladan, istiqamət verən, davam etdirən prosesdir. Bu, istər kitab oxumaq olsun, istərsə də gündəlik həyatda edilən hər hansı bir hərəkət. İnsan orqanizmi nəyə ehtiyac duyarsa, həmin istək yerinə yetirilir. Yəni orqanizm ehtiyac duyduğu istəkləri yerinə yetirdiyi zaman motivasiya yaranır.

Motivasiya davranışı aktivləşdirən emosional, sosial, bioloji və koqnitiv qüvvələri əhatə edir və insan davranışının hərəkətverici qüvvəsidir. Gündəlik həyatda "motivasiya" termini bir insanın hər hansısa bir işi niyə etdiyini təsvir etmək üçün istifadə edilir.

Xarici dil dərslərində də yeni dərsin izahı zamanı motivasiya olaraq şifahi xalq ədəbiyyatından geniş istifadə olunur. Lakin ilkin mərhələdə müəllim əfsanə, tapmaca, nağıl və yanıltmacları tədris edərkən onlar haqqında qısa məlumat verməlidir. Onların şifahi xalq ədəbiyyatının məhsulu olduğunu, və onların yaranması zamanı arxasında duran tarixçəni qısa olaraq izah etməlidir.

***Açar sözlər:*** *müəllim, şagird, motivasiya, nağıl, tapmaca*

**Aysel Ibrahimova**
Azerbaijan State Pedagogical University
https://orcid.org/0009-0009-7321-7159
aysel-ibrahimova2015@mail.ru

# The use of Oral Folk Literature in Learning New Words in Foreign Language Teaching and Their Impact on Motivation

### Abstract

Motivation plays an important role in human life. An important factor for making wishes and making efforts to realize these wishes is motivation. Motivation is the desire to continue making efforts towards meaning, purpose, and life. At the same time, motivation is the process that initiates, directs, and continues purposeful behavior. This is whether it is reading a book or any action is taken in daily life. Whatever the human body needs, that desire is fulfilled. That is, motivation arises when the body fulfills the desires it needs.

Motivation encompasses the emotional, social, biological, and cognitive forces that activate behavior and is the driving force of human behavior. In everyday life, the term "motivation" is used to describe why a person does something.

Oral folk literature is also widely used as motivation when explaining a new lesson in foreign language lessons. However, at the initial stage, when teaching legends, riddles, fairy tales and riddles, the teacher should provide brief information about them. He should briefly explain that they are products of oral folk literature, and the history behind their creation.

***Keywords:*** *teacher, student, motivation, fairy tale, riddle*

## Giriş

Şifahi xalq ədəbiyyatının ən geniş yayılmış və ən çox motivasiyaedici növü nağıllardır. Uşaq vaxtlarımızdan etibarən bizə danışılan nağıllarda həm pis, həm yaxşı personajlar vardır. Dinlədiyimiz nağılların hamısında xeyir şərə qalib gəlir. Uşaqlıqdan bizi həyəcanlandıran bu nağılları tədris prosesi zamanı istifadə etməklə həm oxu, dinləmə, tələffüz qabiliyyətini tədris etmiş, həm əxlaqı keyfiyyətləri aşılamış, həm də öyrənənlərin motivasiyasını artırmış olarıq. Bir çox bacarığı eyni anda təlqin etmiş, öyrətmiş oluruq. Məsələn: “Günəşin nağılı”, “Məlikməmməd nağılı”, “Ağıllı qoca”, “Daşdəmirin nağılı”, “Göyçək Fatma” və s. kimi nağıllar vasitəsilə uşaqlara səbrli, dürüst və çalışqan, daim doğru yolda olmaqla sonda zəfər çalmaq kimi gözəl əxlaqi keyfiyyətlər aşılamaq, bu nağıllarla gələcəyə ümid bəsləyən, motivasiyası güclü olan və sarsılmayan bir nəsil yetişdirməliyik. Məsələn, “Cindrella” nağılına baxaq. “Cindrella” nağılının Azərbaycan ekvivalenti “Göyçək Fatma” dır. Cindrella iki ögey bacısı olan və ögey ana əlində böyümüş, onların tənə, fitnə - fəsadlarından əziyyət çəkən gənc qızdır. Evin xanımı olmasına baxmayaraq onunla qulluqçu kimi davranılır və evin bütün işlərini görməsinə məcbur edilir. Bütün bunlara baxmayaraq Cindrella qəlbi təmiz, gözəl insan və sadiq dostdur. Heyvanları çox sevir, onlarla dostluq edir və bütün dərd – qəmini onlarla paylaşır (Azərbaycan uşaq ədəbiyyatı antalogiyası, 2005).

**Tədqiqat**

Nağılın sonunda ona qarşı edilən pisliklərə baxmayaraq yenə də xeyir şərə qalib gəlir və o, sevdiyi insana qovuşur, ölkənin şəhzadəsilə evlənir.

Digər bir nümunə isə “The tale of Peter Rabbit” (Beatrix Potter-İngilis yazıçı, illustrator) - “Peter dovşanın nağılı” dır.

Dörd kiçik dovşan Flopsi, Mopsi, Pambıq quyruq və Peter qardaşları vardı. Onlardan Flospi, Mopsi, Pambıq quyruq ağıllı, sözəbaxan, Peter isə dəcəl və yaramaz idi. Analarının “qonşu cənab Mak Qreqorun dirliyinə girməyin!” tapşırığına məhəl qoymayıb, Peter qonşunun bağına darvazanın altından girir və kahı, lobya və turp yeyir. Sonra özünü pis hiss etdiyi üçün cəfəri axtarır. Elə bu zaman, o qonşu Mak Qreqorla rastlaşır. Qonşu onu görən kimi arxasınca dırmıq atır. Peter çox qorxur və bütün bağı qaçaraq fırlanır. Lakin qapıya olan yolu unutduğu üçün qapıdan çıxa bilmir. Ayaqqabılarını itirməsi, onun daha da sürətli qaçmasına səbəb olur. O, qonşunun əlindən qaça bilərdi, lakin onun pencəyi qarğıdalı toruna ilişir. O, ağlamağa başlayır və mehriban sərçələr onun köməyinə gəlirlər və ona bu tordan xilas olmağa kömək edirlər. Peter, alət anbarında gizlənir. Qonşu onu burda tutacağına əmin idi. Lakin, Peter buradan da qaçmağı bacarır. Qapını axtarır, divarda bir qapı tapır, amma qapının kilidli olduğunu görür. O, yenidən darvazanı axtarmağa başlayır və nəhayət gəldiyi yeri taparaq, qapının altından kənara çıxa bilir. Peter o qədər qorxmuşdu ki, evlərinə qədər arxasına baxmadan qaçır. O, evə çatan kimi uzanır. Həm qorxmuş, həm də çox yorulmuşdu. Bütün gecə özünü pis hiss edirdi. Peter həmin gecə ac qalır. Lakin qardaşları süd, böyürtkən və çörək yeyirlər (Vəfalı, 1976).

Bu nağılda anasının sözünə və xəbərdarlığına məhəl qoymayıb, onun qadağan etdiyi məşğuliyyəti edən dəcəl Peter dovşanın bir çox qorxulu sınaqlardan keçməsi və bu səbəbdən də xəstələnməsindən bəhs edilir. Bu nağılda da, əxlaqi keyfiyyətlər ön plandadır. Nağılın oxuyucusuna vermək istədiyi ismarıc isə “böyüyün sözünə baxmayan, xeyir tapmaz” dır.

Hər bir nağılın oxuyucusuna çatdırmaq istədiyi əxlaqi keyfiyyət vardır.

Nağılların xeyirin şərə qalib gəlməsi ilə sonlanması bizdə və yeni nəsildə ümid işığı yandırır, gələcəyimizin parlaq olacağına dair ümidlərimizi daim canlı saxlayır, motivasiyamızın güclü və daim olmasına yardım edir (Zeynaloğlu, 2017).

Eyni zamanda nağıllar insanın, əsas da uşaqların xəyallar aləminin, təxəyyülünün zənginləşməsinə kömək edir. Dahi alman fiziki, nəzəriyyəçi olan Albert Eynşteyn nağılların uşaqlara təsirini araşdırmış və nağıllar haqqında belə deyirdi: *“If you want your children to be intelligent, read them fairy tales. If you want them to be more intelligent, read them more fairy tales”* – “Övladlarınızın ağıllı olmasını istəyirsinizsə onlara nağıllar oxuyun. Daha ağıllı olmalarını istəyirsinizsə, daha çox nağıl oxuyun (Easy riddles)”.

**Yanıltmac və tapmacaların motivasiyaedici amil kimi**

Yanıltmac və tapmacalar motivasiya ilə çox əlaqəsi olmasa da, yarı motivasiya və ya həvəsləndirici üsul sayıla bilər. Yanıltmac və tapmacalardan şagirdlərin yorğunluğunu aradan qaldırmaq və onları dərsə qarşı həvəsləndirmək üçün istifadə edə bilərik. Bu, eyni zamanda onların dil qabiliyyətlərini inkişaf etdirəcək, dil əzələlərini məşq elətdirərək, tələffüzlərinin inkişaf etməsinə səbəb olacaqdır. Yanıltmacların “tounge twister“ dərin mənası yoxdur və əxlaqi keyfiyyətləri aşılamır. Buna baxmayaraq, dərs zamanı bu janrlardan istifadə həm əyləncəli mühit yaradacaqdır, həm də dil qabiliyyətlərini inkişaf etdirməkdə yardımcı vasitə olacaqdır. Məsələn,

“Peter Piper picked a peck of pickled peppers;
A peck of pickled peppers Peter piper picked;
If Peter Piper picked a peck of pickled peppers,
Where’s the peck of pickled peppers Peter Piper pickled” (Mondly, 2019)

Tapmacalar vasitəsilə bir sıra üsullardan istifadə edərək təlimləndirici oyunlar təşkil etməklə dərsin sıxıcı və neytral deyil, daha canlı, şən keçməsini təmin edə bilərik. Məsələn, uşaq sayına görə onları iki və ya üç qrupa ayırıb, müxtəlif tapmacalar verib, ən sürətli tapan qrupu mükafatlandırmaqla onlara həm tapmacaları tədris etmiş olarıq, həm ingilis dilində düşünmə qabiliyyətini, həm oxuma, həm dinləmə, həm tələffüz bacarıqlarını inkişaf etdirmiş olarıq. Bir neçə tapmacanı nümunə olaraq qeyd etmək istərdim.

I’m tall when I’m young, and I’m short when I’m old. What am I? (Candle)
What is always in front of you but can’t be seen? (The future)
What goes up but never comes down? (The age)
What has many keys but can’t open a single lock? (A piano)
What has words, but never speaks? (A book) (Easy riddles).

**Aforizmlər motivasiyaedici edici amil kimi.**

Şifahi xalq ədəbiyyatında atalar sözləri, yazılı ədəbiyyatda isə aforizmlər ekvivalentdir. Tarixən ulu babalarımızı həyat sınağından çıxmış ifadələr atalar sözləri, müdriklərin, yazıçı, şairlərin, alimlərin təcrübələrindən süzülən kəlamlar isə aforizmlər şəkində günümüzdə qarşımıza çox çıxır. Hətta deyərdim ki, günümüzdə bir çoxumuz çətinə düşəndə, çıxış yolu axtaranda el məsəli, atalar sözü, məşhur aforizmləri xatırlayıb özümüzə lazımi dərs çıxara bilirik.

Bu baxımdan müasir, fəal dərs sistemində bu cür kəlamlardan istifadə çox effektiv nəticə verər. Bunun üçün müəllimə lazım olan məqamda mövzuya və məqama uyğun kəlamlardan istifadə edə bilmə bacarığının olmasıdır. Məsələn, şagird dərsdə sadəcə qiymət almağa, bilik bacarıq əldə etməkdən daha çox qiymət üçün çalışırsa belə bir motivəedici kəlamı yada salaraq, Eynşteynin təcrübəli, müdrik ifadələrindən istifadə edə bilərik:

“The value of achievement lies in the achieving.” – “Uğurun dəyəri nail olmaqdadır”.

Və ya: “Science can flourish only in an atmosphere of free speech.” – “Elm yalnız müstəqil şəkildə fikir mübadiləsi edə biləcəyimiz yerdə çiçəklənə bilər. – deyərək şagirdlərin daha çox sərbəst fikir yürüdə bilmələri üçün şərait yarada bilərik.

Başqa bir motivə edici aforizmə diqqət edək:

“Logic will get you from A to B. Imagination will take you everywhere” – Məntiq sizi A nöqtəsindən B nöqtəsinə apara bilər. Xəyal etmək isə hər yerə.

“The true sign of intelligence is not knowledge but imagination.” – Zəkanın əsl əlaməti bilik deyil, xəyaldır.

“The only source of knowledge is experience” – Biliyin tək mənbəyi təcrübədir.

“Imagination is the highest form of research” – Təsəvvür ən yüksək tədqiqat formasıdır.

“If at first, you don’t succeed, try, try again. Then quit. There’s no point in being a damn fool about it.”-İlk cəhdlərdə uğur qazana bilmirsinizsə, cəhd edin, bir daha cəhd edin. Bir mövzuda axmaq olmağın heç bir əhəmiyyəti yoxdur (Bayramov, 2006).

“Develop success from failures. Discouragement and failure are two of the surest stepping stones to success”. - Uğursuzluqlardan uğur əldə edin. Məyusluq və uğursuzluq müvəffəqiyyət üçün ən əmin addımlardan biridir.

"The successful man will profit from his mistakes and try again in a different way."- Müvəffəqiyyət qazanmış adam səhvlərindən faydalanacaq və fərqli bir şəkildə yenidən cəhd edəcəkdir (Gvardzhaladze, Mchedlishvili, 1979, s. 55).

Lazım gəldikcə, dərs zamanı, mövzu ilə əlaqədər olaraq biz bu kəlamlardan istəfadə edərək şagirdlərimizdə yüksək əhval-ruhiyyə yarada bilərik. Hətta sinifdə belə kəlamlardan ibarət tablo hazırlayıb sinif qapısına, uşaqların daim görə biləcəkləri bir yerə asmaq daha gözəl effekt verə bilər. Məsələn, *"Kim ki, alimliyi və ya zəkası ilə öyünür, demək onun nə alimliyi var, nə də zəkası var"* Ernest Heminqueyin bu sitatından istifadə edərək öyünməyin mənfi xüsusiyyyət olduğunu, F.M.Dostoyevskinin "İnsanı məhv etmək üçün çox az şey tələb olunur: onu sadəcə inandırmaq lazımdır ki, onun məşğul olduğu iş heç kəsə gərək deyil", - sitatı ilə inamsızlığın insanı məhvə doğru aparan ən əsas qüvvə olduğunu, L.N.Tolstoyun "Fikir – hər şeyin başlanğıcıdır. Fikirləri də idarə etmək mümkündür. Ona görə də mükəmməlliyin başlıca şərti – fikirlər üzərində işləməkdir", - kəlamı ilə şagirdlərin fikirlərini sərbəst şəkildə ifadə edə bilməyin zəruriliyi, Louis Stevensonun **"**Ümidlə yol getmək gediləcək yerə çatmaqdan daha gözəldir" - sitatı ilə ümidin, nikbinliyin uğurun əsas təməli olması məsələsini daha təsirli şəkildə ifadə edə bilərik (Motivasiyaedici 19 sitat, 2013).

## Nəticə

Ümumiyyətlə, tədris zamanı bir müddətdən sonra şagird və tələbələr yorulur və yorulduqda onların qavrama qabiliyyəti zəifləmiş olur. Bu zaman keçirilən materiallar şagird və tələbələr tərəfindən çətin qavranılır və motivasiyaları çox zəif olur. Həmin vaxt nağıl, tapmaca, yanıltapmaclardan istifadə etməklə onların yorğunluğunu aradan qaldırmış və onlarda öyrənməyə az da olsa motiv yaratmış oluruq. Sonda belə bir qənaətə gəlmiş oluruq ki, şifahi xalq ədəbiyyatımızın qolları olan nağıllar, tapmacalar, aforizmlər nəinki dərslərdə, mövzunu izah edən zaman, hətta şagirdlərimizdə müəyyən əxlaqi dəyər formalaşdırmaq üçün də müəllimlərimizin köməyinə çata bilər.

## Ədəbiyyat

1. Azərbaycan uşaq ədəbiyyatı antalogiyası. III cild. (2005). Bakı: Öndər nəşriyyat, 240.
2. Bayramov, Ə.Ə. (2006). *Psixologiya.* Bakı: "Çinar-Çap", 620.
3. Easy riddles. (n.d.). Parade.
4. Gvardzhaladze, I.S., Mchedlishvili, D.I. (1979). *Angliyskiye poslovitsy i pogovorki*. Moskva: Vysshaya shkola, 79.
   https://banker.az/motivasiya-edici-19-sitat/
   https://parade.com/947956/parade/riddles/
5. Mondly. (2019, avqust 23). 71 best tongue twisters to perfect your English pronunciation. https://www.mondly.com/blog/2019/08/23/71-best-tongue-twisters-to-perfect-your-english-pronunciation/
6. Motivasiyaedici 19 sitat. (2013, dekabr 5). Banker.az
7. Vəfalı, A. (1976). *Atalar sözü-ağlın gözü (dünya xalqlarının atalar sözü və məsəlləri)*. Bakı: Azərbaycan Dövlət Nəşriyyatı, 212.
8. Zeynaloğlu, C. (2017). *Təlim fəaliyyətinin psixoloji xüsusiyyəti*. Bakı: "Print-S" nəşriyyatı, 144.

Daxil oldu: 12.12.2024
Qəbul edildi: 17.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/112-114

**Aqil Əliyev**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
magistrant
https://orcid.org/0009-0006-8361-2476
kitabsevas@gmail.com

# Azərbaycan musiqişünaslığının araşdırılmasında Leopold və Mstislav Rostropoviçlərin xatirə ev muzeyinin rolu

**Xülasə**

Azərbaycan musiqisinin inkişafına bir çox görkəmli şəxsiyyətlərin əhəmiyyətli təsiri olmuşdur ki, onların arasında Leopold və Mstislav Rostropoviçlər də əsas rol oynamışlar. Onların təsiri həm dünya, həm də Azərbaycan musiqişünaslığında iz buraxmışdır.

Mstislav Leopoldoviç Rostropoviç 20-21-ci əsrlərin tanınmış violonçel ifaçısı və dirijoru, dünya musiqi mədəniyyətinin nəhənglərindən biri hesab olunurdu. O, müasir Azərbaycanın müxtəlif sahələrdə inkişafına mühüm töhfələr verib, ictimai işlərə fəal dəstək verib. Bakıdan olan bu sənətkar Azərbaycan mədəniyyətinin inkişafına, gələcək musiqiçilərin yetişməsinə mühüm töhfələr verib. Onun ustad dərsləri, dinləmə seansları və musiqiçilərə dəyərli məsləhətləri çox təsir etdi.

Ümummilli Lider Heydər Əliyev onların dünya musiqi sənətinin inkişafındakı müstəsna xidmətlərini nəzərə alaraq, Leopold və Mstislav Rostropoviçlərin şərəfinə xatirə ev-muzeyi yaratmaq qərarına gəldi. Muzeyin rəsmi açılışı 2002-ci il martın 4-də olmuşdur.

***Açar sözlər:*** *Leopold Rostropoviç və Mstislav Rostropoviç, xatirə-ev muzeyi, musiqişünaslıq, musiqi irsi*

**Agil Aliyev**
Azerbaijan State University of Culture and Arts
Master student
https://orcid.org/0009-0006-8361-2476
kitabsevas@gmail.com

# The role of the Leopold and Mstislav Rostropoviches Memorial House Museum in the Research of Azerbaijani Musicology

**Abstract**

The development of Azerbaijani music has been significantly influenced by many prominent individuals, among whom Leopold and Mstislav Rostropovich played a key role. Their impact has left a mark on both the global and Azerbaijani musicology.

Mstislav Leopoldovich Rostropovich was a renowned cellist and conductor of the 20th and 21st centuries, considered one of the giants of world music culture. He made substantial contributions to the development of modern Azerbaijan in various fields and also actively supported social causes. Being from Baku, this artist contributed significantly to the development of Azerbaijani culture and the training of future musicians. His masterclasses, listening sessions, and valuable advice to musicians were highly impactful.

In recognition of their outstanding contributions to the development of global musical art, the National Leader Heydar Aliyev decided to create a memorial house-museum in honor of Leopold and Mstislav Rostropoviches. The museum was officially opened on March 4, 2002.

***Keywords:*** *Leopold and Mstislav Rostropoviches, memorial house museum, musicology, musical heritage*

## Giriş

Mstislav Leopoldoviç Rostropoviç XX-XXI əsr dünyanın tanınmış violenç ifaçısı və dirijoru idi. Həmçinin Mstislav Rostropoviç dünya musiqi mədəniyyətinin korifeylərindən sayılır. O bir çox sahədə müasir Azərbaycanın inkişafına töhfələr verən və böyük sosial yardımlar edən bir şəxsiyyətdir. Əslən bakılı olan bu sənətkar Azərbaycan mədəniyyətinin inkişafında, eləcə də gələcək musiqiçilərin yetişməsində az əmək sərf etməmişdir. Onun ustad dərsləri keçməsi, musiqiçiləri dinləməsi, onlara tövsiyələrini bildirməsi də az əhəmiyyət daşımır. Bu baxımdan Leopold və Mstislav Rostropoviçlərin xatirəsinin əbədiləşdirilməsi üçün Ulu Öndər Heydər Əliyev Leopold və Mstislav Rostropoviçlərin dünya musiqi sənətinin inkişafında görkəmli xidmətlərini nəzərə alaraq, xatirə ev-muzeyinin yaradılmasını qərara alır. Sənəddən oxuyuruq:

**Tədqiqat**

“Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev. Bakı şəhəri, 23 may 1997-ci il. №571

Leopold və Mstislav Rostropoviçlərin dünya musiqi sənətinin inkişafında görkəmli xidmətlərini nəzərə alaraq qərara alıram:

1. Leopold və Mstislav Rostropoviçlərin yaşadıqları mənzildə (Bakı şəhəri Leopold və Mstislav Rostropoviçlərin küçəsi. 19) ev-muzeyi təşkil olunsun.
2. Nazirlər Kabineti və Bakı şəhəri İcra Hakimiyyəti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

1988-ci ildə Azərbaycan Nazirlər Kabinetinin qərarı ilə görkəmli musiqiçilərin Leopold və Mstislav Rostropoviçlərin xatirə ev-muzeyi yaradılmışdır. Leopold və Mstislav Rostropoviçlərin ev-muzeyi dünya şöhrətli violonçelist, Mstislav Rostropoviçin anadan olduğu və uşaqlıq illərini keçirdiyi evdədir. Muzey 2002-ci il mart ayının 4-də açılmışdır (Məlikova, 2009).

Azərbaycan musiqişünaslığının inkişafında Mstislav Rostropoviçin rolu olduqca böyükdür. Bunu 2009-cu ildən bəri hər il keçirilən Qəbələ musiqi festivalında görə bilərik. Beləki, 2012-ci ildə Qəbələ IV Beynəlxalq Musiqi Festivalı çərçivəsində növbəti kamera musiqisi axşamı keçirilmişdir. Bu konsretdə Mstislav Rostropoviç adına musiqi fondunun təqaüdçüsü Andrey Yaroşinskinin də iştirakı olmuşdur (Qəbələ IV Beynəlxalq Musiqi Festivalı çərçivəsində növbəti kamera musiqisi axşamı, 2012).

Qeyd etmək lazımdır ki, muzeyin keçmiş direktoru Şeyla Heydərovanın rəhbərliyi ilə daima Leopold və Mstislav Rostropoviçin xatirəsi yad edilərək mütəmadi olaraq konsert və tədbirlər keçirilir. Mstislav Rostropoviç və Qalina Vişnevskaya dəfələrlə Leopold və Mstislav Rostropoviçlərin ev-muzeyində olmuş, xoş təəssüratlarla muzeyin təşkilatçılığına, o cümlədən Şeyla Heydərovaya minnətdarlıqlarını bildirmişlər (Mustafayeva, 2019).

Məsələn, muzeydə hər il Beynəlxalq Rostropoviç Festivalı keçirilir. 2015-ci il May ayının 20-də Leopold və Mstislav Rostropoviçlərin ev-muzeyində VIII Beynəlxalq Rostropoviç Festivalının iştirakçıları – M.Rostropoviç Fondunun təqaüdçüləri və Qalina Vişnevskaya adına Opera İfaçılıq Mərkəzinin solistləri, həmçinnin Azərbaycanın gənc ifaçıları ilə görüş keçirilib.

Muzeyin direktoru Şeyla Heydərova M.Rostropoviç Fondunun prezidenti və Q.Vişnevskaya adına Opera İfaçılıq Mərkəzinin bədii rəhbəri Olqa Rostropoviçi və digər qonaqları salamlayaraq paytaxtımızda ənənəvi olaraq keçirilən festivalın klassik musiqisevərlərin bayramına çevrildiyini vurğulamışdır (Rostropoviçlərin ev-muzeyində görüş, 2015). Əlbəttə ki, mədəni irsin qorunub gələcək nəslə çatdırılması və Azərbaycan incəsənətinin daha da yüksək səviyyəyə qalxması üçün muzeydə Festivallar keçirilməsi vacibdir.

Leopold Rostropoviçin bəstələdiyi partituraların atribusiyası da bu prinsiplərə uyğun aparılır. Onun musiqi əsərləri, yalnız nota yazılmış hərflərdən ibarət deyil, eyni zamanda dövrün musiqi mədəniyyətinə olan təsirini və onun şəxsi yaradıcılıq prosesini izah edir. Partituralar üzərində aparılan tədqiqatlar, Rostropoviçin musiqisindəki əsas mövzuları və texnikaları anlamağa kömək edir (Aslanov, 2020).

Digər bir nümunə olaraq isə Rostropoviçlərin ev-muzeyində “Kamera musiqi gecəsi” keçirilmişdir. 2011-ci il dekabrın 9-da Maestronun xatirə ev-muzeyində V Mstislav Rostropoviç Festivalı keçirilmişdir. Tədbiri muzeyin direktoru Şeyla Heydərova açaraq qonaqları salamlamışdır. Mstislav Rostropoviç Fondunun prezidenti Olqa Rostropoviçə dəvəti qəbul etdiyinə görə

təşəkkürünü bildirdi. Sonra festivalın 5 illik tarixini əhatə edən slayd-şou nümayiş etdirildi. Tədbirdə çıxış edən Olqa Rostropoviç atasının xatirəsini yad etməyə gələnlərə minnətdarlığını bildirdi. O, 2007-ci ildə Bakıda keçirilən ilk festivalla bağlı öz təəssüratlarını danışdır: "Birinci iş həmişə çətin olur. İndi artıq V festival keçirilir. Düşünürəm ki, ilbəil festivalın əhatə dairəsi daha da genişlənəcək" (Lalə Azəri, 2011).

2024-cü il sentyabrın 19-də Muzeyin icraçı rəhbəri Günay Əliyevanın təşəbbüsü ilə muzeydə konsert təşkil olunmuşdur. Konsertin əsas məğzi 18-sentyabr Milli Musiqi Günü münasibətilə əlaqəli olmuşdur. Günay xanım tədbirdə görkəmli violonçelist Leopold Rostropoviç və dahi bəstəkarımız Üzeyir Hacıbəylinin yaxın dostluq və yaradıcılıq əlaqələrindən bəhs etmişdir. Sonra tədbir konsert proqramı ilə davam edib. Proqramda Azərbaycan Milli Konservatoriyası tərkibində fəaliyyət göstərən İncəsənət Gimnaziyasının şagirdləri Üzeyir Hacıbəylinin əsərlərini ifa ediblər. Gimnaziyanın rəhbəri Aytən Əhmədova diqqətə çatdırıb ki, konsertdə çıxış edən şagirdlər ölkəmizi beynəlxalq müsabiqələrdə də uğurla təmsil edirlər.

Günay Əliyeva gənc istedadlara qazandıqları uğurlara görə təbriklərini çatdırıb, gözəl ifalarına görə onlara muzey adından təşəkkürnamələr təqdim edib (Rostropoviçlərin ev-muzeyində klassik musiqi konserti, 2024).

Mstislav Rostropoviç Azərbaycan musiqişünaslığının inkişafına misilsiz töhfələr vermiş böyük şəxsiyyət olmuşdur. O, violonçel ifaçılığı tarixinə yenilik gətirmiş və ən mötəbər konsert salonlarında orkestr dirijoru kimi çıxışlar etmişdir. Bununla da bəşəriyyətə öz töhfələrini vermişdir.

Mstislav Rostropoviçi doğma vətəni Azərbaycanın beynəlxalq mədəni əlaqələrinin möhkəmləndirilməsində və xalqımızın musiqi sənətinin inkişaf etdirilməsində müstəsna xidmətləri olmuşdur.

"Literaturnaya qazeta" 28 may tarixli sayının 1 və 3-cü səhifələrinin M.Rostropoviçə həsr etmiş, onunla geniş müsahibə vermişdir. Bu müsahibədə görkəmli sənətkar Azərbaycana, onun musiqisinə, Bakıya vurğunluğunu bildirmiş və Azərbaycan prezidentinin fəaliyyətini yüksək qiymətləndirmişdir (Xalq qəzeti, 1997).

## Nəticə

Qeyd etdiyim kimi Mstislav Rostropoviç Rostropoviçlər nəslində olan musiqi istedadının zirvəsi sayılır. Mstislav Rostropoviçin dünya musiqi mədəniyyətindəki rolunu tam şəkildə qiymətləndirmək çətin olar lakin Azərbaycan musiqisi üçün etdikləri fədakarlıqlar isə danılmazdır.

## Ədəbiyyat

1. Aslanov, R. (2020). *Rostropoviç və Musiqi: Onun Yaradıcı Dəyişiklikləri*. Bakı: İncəsənət Nəşriyyatı.
2. Xalq qəzeti. (1997, iyun 12).
3. Qəbələ IV Beynəlxalq Musiqi Festivalı çərçivəsində növbəti kamera musiqisi axşamı. (2012, iyul 27). https://www.azerbaijan-news.az/index.php/az/posts/detail/qebele-iv-beynelxalq-musiqi-festivali-cherchivesinde-novbeti-kamera-musiqisi-axshami-46601
4. Lalə Azəri. (2011, dekabr 14). Rostropoviçlərin ev-muzeyində "Kamera musiqi gecəsi". Mədəniyyət, 5. https://www.anl.az/down/meqale/medeniyyet/2011/dekabr/219460.htm
5. Məlikova, E. (2009). *Azərbaycanın memorial xatirə muzeyləri*. Dərslik. Bakı, 93.
6. Mustafayeva, T. (2019). *Azərbaycanda milli violonçel sənətinin yaranmasına.* Dərslik. Bakı.
7. Rostropoviçlərin ev-muzeyində görüş. (2015, 13 iyun). Mədəniyyət, 11. https://www.anl.az/down/meqale/medeniyyet/2015/iyun/441539.htm
8. Rostropoviçlərin ev-muzeyində klassik musiqi konserti. (2024, sentyabr 18). https://medeniyyet.info.az/page/news/75741/Rostropoviclerin-evmuzeyinde-klassik-musiqi-konserti.html

Daxil oldu: 16.12.2024
Qəbul edildi: 21.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/115-126

**Laçın Kamilov**
Azərbaycan Dövlət İqtisad Universiteti
magistrant
https://orcid.org/0009-0001-4867-0623
kamilovlachin@gmail.com

# Biznes qərarlarının əsaslandırılmasında hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun tətbiqi

## Xülasə

Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu – şirkətin mənfəət əldə etməsinə kömək edən bir metod kimi, məhsulun istehsalı və xidmətin göstərilməsi zamanı, xərclərin maksimum icazə verilən səviyyəsini müəyyənləşdirir. Bu metod bazar qiymətinin təhlili ilə başlayır, yəni hədəf seqmenti üçün qəbul edilə bilən qiymət təyin edilir və bu, xərclərin hesablanmasının əsasını təşkil edir. Məhsul inkişafının erkən mərhələlərində maliyyə üzrə mütəxəssislərin iştirakı ilə xərclərin optimallaşdırılması həyata keçirilir. Bu prosesdə "marketinq mövqeləndirilməsi", "SWOT təhlili", "rəqabət mühitinin təhlili", "zərərsizlik nöqtəsinin hesablanması" kimi anlayışlar və həmçinin "həyat dövrü xərcləri" ilə "maliyyə səmərəliliyi" konsepsiyaları istifadə olunur. Bu yanaşma məhsulun həyat dövrünün bütün mərhələlərində xərclərin nəzarətini təmin edir, tələb olunan rentabelliyi qoruyur və proseslərin optimallaşdırılması, texnologiyaların təkmilləşdirilməsi istiqamətində əsaslı biznes qərarlarının qəbuluna şərait yaradır. Lakin, metodun uğurlu tətbiqi üçün bazar şəraitinin dəqiq proqnozlaşdırılması, əsas performans göstəricilərin (KPI) təhlili və bütün maraqlı tərəflərin aktiv iştirakı tələb olunur ki, bu da yüksək qeyri-müəyyənlik şəraitində çətinlik yarada bilər. Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu bir neçə mərhələdən ibarətdir: hədəf qiymətin müəyyən edilməsi üçün bazar analizi, mənfəətin hesablanması, icazə verilən maya dəyərinin təyin edilməsi, məhsulun optimizasiyası və xərclərə nəzarət. Bu metod rəqabət qabiliyyətini artırır, resursların idarə edilməsini yaxşılaşdırır, lakin detallı təhlil tələb etdiyi üçün xərcləri artırır.

***Açar sözlər:*** *hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu, mənfəət, marketinq, xərclər, məhsul*

**Lachin Kamilov**
Azerbaijan State University of Economics
Master student
https://orcid.org/0009-0001-4867-0623
kamilovlachin@gmail.com

# Application of the Cost Method Based on Target Indicatior In Justifying Business Decisions

## Abstract

Target costing is a method that helps a company achieve the desired profit by determining the maximum allowable cost for producing a product or delivering a service. The method starts with analyzing the market price, establishing an acceptable price for the target segment, which serves as the basis for cost calculations. In the early stages of product development, specialists from marketing, production, and finance are involved to collaboratively optimize costs. In this process, concepts such as "marketing positioning," "SWOT analysis," "competitive environment analysis," are used, as well as the concepts of "lifecycle cost" and "financial efficiency." This approach helps control expenses at all stages of the product lifecycle, maintain the required profitability, and make sound business decisions aimed at optimizing processes and improving technologies. However, the

successful application of the method requires accurately forecasting market conditions, analyzing key performance indicators (KPIs), and ensuring active participation from all stakeholders, which can be challenging in conditions of high uncertainty. The target costing process includes several stages: market analysis to determine the target price, profit calculation, establishing allowable cost, product optimization, and cost control. This method enhances competitiveness, improves resource management, but requires detailed analysis, which increases expenses.

***Keywords:*** *Cost method based on target indicator, profit, marketing, expenses, product*

## Giriş

Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu şirkətlərə bazar tələbləri və rəqabət şəraitini nəzərə alaraq məhsulu inkişaf etdirməyə imkan verən strateji xərclərin idarə olunması alətidir. Bu metodun əsas məqsədi, müəyyən edilmiş bazar qiymətində zəruri gəlirlilik səviyyəsini təmin edən gəlir hədəfinə nail olmaqdır. Bu yanaşma avtomobilqayırma, elektronika və məişət texnikası istehsalı kimi yüksək rəqabətli və məhsulun həyat dövrünün ilkin mərhələlərində xərclər nəzarətinin vacib olduğu müxtəlif sənaye sahələrində geniş tətbiq olunur.

Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun əsas prinsiplərindən biri bazar və müştərilərə yönəlik olmasıdır. Ənənəvi məhsul dəyərinin hesablanması metodlarından fərqli olaraq, hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunda xərclərin hesablanması daxili istehsal xərclərinin təhlilindən deyil, bazar qiymətinin araşdırılmasından başlayır. Şirkət əvvəlcə, istehlakçıların məhsullar üçün nə qədər ödəməyə hazır olduqlarını qiymətləndirir və daha sonra icazə verilən xərclər səviyyəsini müəyyənləşdirir. Belə yanaşma, məhsulun yalnız müştərilərin gözləntilərinə cavab verməsini deyil, həm də bazarda rəqabət qabiliyyətinin qorumasını təmin edir (Temirgalieva, Satalkina, 2018).

Digər vacib prinsip hədəflənən gəlirin müəyyən edilməsidir. İstehsalın planlaşdırılması prosesində şirkət təmin edilməli gəlirlilik səviyyəsini müəyyən edir. Bu, məhsulun marjinal qazanclarının layihələndirmə mərhələsində nəzərə alınması deməkdir və sonrakı addımlar xərclərin optimallaşdırılmasına yönəldilir ki, müəyyən edilmiş maliyyə göstəricilərinə nail olunsun. Beləliklə, hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu, xüsusilə qeyri-sabit bazar şəraitində və yüksək rəqabət mövcudluğunda, gəlirliliyin strateji idarə olunmasına töhfə verir (Smirnova, 2014, p. 2-8).

Şəkil 1. Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun yanaşması



Başqa bir əsas prinsip xərclərin optimallaşdırılmasıdır. Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu çərçivəsində layihələndirmədən material seçiminə, istehsalın təşkili və logistikaya qədər bütün proseslər məhsul keyfiyyətinə zərər vermədən xərclərin azaldılmasına yönəlib. Bu, innovativ texnologiyaların tətbiqi, resursların daha səmərəli istifadəsi və satınalmaların və təchizat zəncirinin edarəedilməsi inteqrasiya vasitəsilə əldə edilir. Qeyd etmək lazımdır ki, xərclərin azaldılması məhsulun istehlakçı xüsusiyyətlərinə mənfi təsir göstərməməlidir, çünki hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun əsas vəzifəsi müştəri üçün mümkün qədər aşağı xərclərlə dəyər yaratmaqdır (Karpova, 2016, p. 90-98).

Cədvəl 1. Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun əsas elementləri.

| Mərhələ | Təsvir |
|---|---|
| Hədəf qiymətin müəyyən edilməsi (Target Price) | Məhsulun bazar qiyməti müəyyən edilir. |
| Hədəflənən mənfəətin müəyyən edilməsi (Target Profit) | Şirkətin strateji hədəflərinə əsasən arzu olunan mənfəət səviyyəsi təyin edilir. |
| Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun hesablanması (Target Cost) | Hədəflənən qiymətlə hədəflənən mənfəət arasındakı fərq kimi hesablanır. |
| Cari istehsal dəyərinin təhlili | Faktiki maya dəyəri mövcud xərclər əsasında müəyyən edilir. |
| Xərclərin azaldılması tədbirlərinin hazırlanması | Hədəf göstəriciyə əsaslanan maya dəyəri metoduna çatmaq üçün xərclərin azaldılması siyasəti hazırlanır. |

Ənənəvi heasablama metodlarına əsasən istehsal mərhələsinə diqqət yetirərkən, hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu məhsulun hesablamasında inkişaf, istehsal, istifadə və hətta istifadədən çıxarılması daxil olmaqla bütün mərhələləri əhatə edir. Belə yanaşma, uzunmüddətli xərclərin nəzərə alınmasını və materialların, texnologiyaların və layihə qərarlarının optimal seçimi vasitəsilə onların azaldılmasını təmin edir. Nəticədə, şirkətlər yalnız istehsal mərhələsində maya dəyərini azaltmaqla kifayətlənmir, həm də gələcəkdə yaranacaq istismar xərclərini minimuma endirə bilirlər ki, bu da avtomobillər, məişət texnikası və elektronika kimi mürəkkəb texniki məhsullar üçün xüsusilə aktualdır.

Beləliklə, hədəf göstəriciyə əsaslanan maya dəyəri metodu yalnız maya dəyərinin hesablama metodu deyil, strateji planlaşdırma və resursların optimallaşdırılmasına əsaslanan kompleks xərclərin idarə olunması sistemidir. Onun tətbiqi şirkətlərə yüksək rəqabət qabiliyyətinə nail olmağa, davamlı gəlirliliyi təmin etməyə və dəyişən bazar şəraitinə uyğunlaşmağa imkan yaradır (Plaskova, 2016, p. 50-57).

**Tədqiqat**

Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun məhsulun maya dəyərinin idarə olunmasında bazar qiyməti və hədəflənən mənfəət əsasında tətbiq olunan strateji yanaşmadır. Ənənəvi metoddan fərqli olaraq, burada ilkin olaraq istehlakçılar üçün qəbul edilə bilən qiymət müəyyən edilir, daha sonra həmin qiymətdən hədəflənən mənfəət çıxılır. Qalan məbləğ müəssisənin xərclərini optimallaşdırmaqla çatdırmalı olduğu maksimal icazə verilən maya dəyəri kimi qəbul edilir. Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun tənliyi aşağıdakı kimidir: [Hədəf göstəriciyə əsaslanan maya dəyəri = Bazar qiyməti − Hədəflənən mənfəət].

Burada, “Bazar qiyməti” – marketinq tədqiqatları və rəqabət təhlili əsasında müəyyən olunan qiymətdir; “Hədəflənən mənfəət” – maliyyə sabitliyini təmin edən və investisiya xərclərini ödəyən arzu olunan rentabellik göstəricisidir; hədəf göstəriciyə əsaslanan maya dəyərinin tətbiqi xüsusilə aqro-sənaye müəssisələri üçün aktualdır, çünki bu yanaşma mövsümi qiymət dəyişikliklərini, xammalın dəyərini, nəqliyyat və məhsulun emal xərclərini nəzərə almağa imkan verir.

Məsələn, “OOO Maslozavod “Kristall” şirkəti innovativ qida fosfolipidlərinin istehsalı texnologiyasını tətbiq edərkən, hədəf göstəriciyə əsaslanan maya dəyərinin hesablanması aşağıdakı kimi aparılır. Əsas məlumatlar növbəti kimi verilib.

Cədvəl 2. Verilənlər.

| **Məlumat** | **Dəyər** |
|---|---|
| Planlaşdırılan bazar qiyməti | 120 rubl/vahid |
| Hədəflənən mənfəət nisbəti | 30% |
| Proqnozlaşdırılan satış həcmi | 6000 vahid |
| Proqnozlaşdırılan maya dəyəri | 720 000 rubl |

Hesablamalar

a. Bir vahid məhsul üçün hədəf göstəriciyə əsaslanan maya dəyərinin hesablanması

b. Hədəf göstəriciyə əsaslanan maya dəyəri = 120 − (120 × 30%) = 120 − 36 = 84 rubl.

c. Ümumi proqnozlaşdırılan satış həcmi üçün hədəf göstəriciyə əsaslanan maya dəyərinin hesablanması: 84 rubl. × 6000 = 504 000 rubl.

d. Smeta maya dəyəri ilə hədəf göstəriciyə əsaslanan maya dəyəri arasındakı fərq: 720 000 − 504 000 = 216 000 rubl.

Bu 216 000 rubl fərq xərclərin optimallaşdırılmasının vacibliyini göstərir. Əks halda, müəssisə rentabelliyin azalması və ya zərərin yaranması riski ilə üzləşə bilər (Loseva, 2020, p. 5-10; Loseva, 2017, p. 29-37).

*“*Hədəf göstəriciyə əsaslanan maya dəyəri*” sistemi üzrə maya dəyərinin hesablanma mərhələləri*

Aparılmış marketinq tədqiqatlarına əsasən, smartfonun əsas bazar qiyməti 1000 USD müəyyən edilmişdir. Bu göstərici bazardakı cari vəziyyəti əks etdirir və istehlakçıların yeni məhsulun dəyəri ilə bağlı ilkin gözləntilərini formalaşdırır. Sözügedən qiymət sonrakı hesablamalar üçün əsas başlanğıc nöqtəsi rolunu oynayır, çünki məhz bu göstərici maya dəyərinin formalaşdırılması siyasətini, gözlənilən mənfəət normasını və cihazın dizayn və istehsalı zamanı nəzərə alınmalı olan xərclərin səviyyəsini müəyyənləşdirir. Bundan əlavə, marketinq analizi satış həcminin 100 000 ədəd olacağını proqnozlaşdırmağa imkan vermişdir. Bu proqnoz potensial tələbi qiymətləndirməyə, şirkətin mümkün gəlirlərini müəyyənləşdirməyə və istehsalın planlaşdırılması, komponentlərin alınması və marketinq strategiyasının işlənib hazırlanması mərhələsində daha dəqiq qərarlar qəbul etməyə şərait yaradır. Beləliklə, bazar qiyməti və proqnozlaşdırılan satış həcmlərinin vəhdəti, hədəf göstəriciyə əsaslanan maya dəyərinin tətbiqi və xərclərin optimallaşdırılması üçün əsas yaradır ki, bu da məhsulun tələb olunan mənfəətlilik səviyyəsinə və rəqabət qabiliyyətinə nail olmağa imkan verir.

Cədvəl 3. Hədəf göstəriciyə əsaslanan maya dəyəri üçün SWOT təhlilinin aparılması.

| **Güclü tərəflər** | **Zəif tərəflər** |
|---|---|
| -Rəqabətqabiliyyətli qiymətlərin müəyyən edilməsinə imkan yaradır<br>-Keyfiyyəti itirmədən xərclərin azaldılmasına fokuslanır | - Xərclərin dəqiq proqnozlaşdırılmasını tələb edir<br>- Həddindən artıq qənaət keyfiyyətin aşağı düşməsinə səbəb ola bilər<br>- Standart olmayan və ya premium məhsullar üçün hər zaman uyğun olmaya bilər<br>- Təhlil və tətbiq üçün yüksək xərclər tələb edir |

| **İmkanlar** | **Təhlükələr** |
|---|---|
| - Təchizat zəncirinin və istehsal proseslərinin optimallaşdırılması<br>- Xərclərin təhlili üçün rəqəmsal texnologiyalardan istifadə<br>- Dəyişikliklərə çevik reaksiya vermək üçün çevik istehsalın inkişafı<br>- Rəqabətqabiliyyətli qiymət sayəsində yeni bazarlara çıxış imkanı | - Rəqiblər daha tez uyğunlaşıb qiymətləri aşağı sala bilərlər<br>- Xərclərin düzgün qiymətləndirilməməsi itkilərə səbəb ola bilər<br>- Material və logistika xərclərinin artması<br>- Ənənəvi biznes modellərinin hədəf xərcləmə sisteminə uyğunlaşdırılmasında çətinliklər |

Funksional və keyfiyyət tələblərinin dəqiqləşdirilməsi (SWOT analizi) şirkətlər üçün zəruridir. Hədəf auditoriya arasında aparılmış sorğu nəticəsində smartfonun əsas funksiyalarının əhəmiyyətlilik dərəcəsi müəyyən edilib (Scribd):

**Cədvəl 4.** Verilənlər.

| **Xüsusiyyətlər** | **Faiz (%)** |
|---|---|
| Ekran | 30% |
| Performans (prosessor və yaddaş) | 25% |
| Batareya | 20% |
| Korpus | 15% |
| Əlavə funksiyalar (kamera, dizayn və s.) | 10% |

Bu göstəricilər istehlakçılar üçün vacib olan funksiyalar əsasında mümkün maya dəyərinin bölüşdürülməsinə imkan yaradır.

Hədəflənən **mənfəətin müəyyən edilməsi və icazə verilən maya dəyərinin hesablanması növbəti abzasda analiz ediləcək.**

Hədəflənən mənfəət hər bir vahid üçün 150 USD səviyyəsində müəyyən edilmişdir (investisiya xərcləri, sahibkarların gözləntiləri və gəlirlilik tələbləri nəzərə alınmaqla). Bu halda, icazə verilən maya dəyəri aşağıdakı düstur əsasında hesablanır:

**İcazə verilən maya dəyəri = Bazar qiyməti – Hədəflənən mənfəət** = 1000 USD – 150 USD= **850 USD (Friedrichsen, Zarea, Taebi, Asadi, 2017,** pp. 45-72)

**Analiz**

**Funksional dekompozisiya və icazə verilən maya dəyərinin bölgüsü hədəflənən göstəriciyə əsaslanan maya dəyərnin bir hissəsidir.**

Funksiyaların əhəmiyyətlilik dərəcəsinə əsasən, 850 USD-lik icazə verilən maya dəyəri aşağıdakı kimi bölüşdürülür:

**Ekran (30%)** = 0.30 × 850 USD = **255 USD**
**Performans (prosessor və yaddaş) (25%)** = 0.25 × 850 USD = **212.5 USD**
**Batareya (20%)** = 0.20 × 850 USD = **170 USD**
**Korpus (15%)** = 0.15 × 850 USD = **127.5 USD**
**Əlavə funksiyalar (10%)** = 0.10 × 850 USD = **85 USD**

**Məhsulun hazırlanması, driftinq xərclərinin qiymətləndirilməsi və "istehsal etmək yoxsa almaq" analizi nümunə ilə analiz olunub.** Smartfonun prototipinin hazırlanması zamanı komponentlər üzrə faktiki (driftinq) xərclərin hesablanması aparılmışdır:

**Cədvəl 5**. Verilənlər.

| **Xüsusiyyətlər** | **Qiymət (USD)** | **Faiz (%)** |
|---|---|---|
| Ekran | 270 | 30% |
| Performans (prosessor və yaddaş) | 210 | 25% |
| Batareya | 180 | 20% |
| Korpus | 130 | 15% |
| Əlavə funksiyalar (kamera, dizayn və s.) | 90 | 10% |
| Ümumi dəyər | 900 | 100% |

**Ümumi driftinq xərcləri =**270 + 210 + 180 + 130 + 90 = **880 USD**

İcazə verilən maya dəyəri ilə müqayisə zamanı xərclərin aşılması müəyyən edilmişdir:

**880 USD – 850 USD = 30 USD** (təxminən **3,5% artıq xərc**).

Bu mərhələdə **istehsal və ya satınalma** analizi də aparılır ki, bu da hansı komponentlərin müəssisə daxilində istehsal edilməsinin, hansılarının isə tədarükçülərdən alınmasının daha sərfəli olduğunu müəyyən etməyə kömək edir.

**Funksiyaların icrası üçün xərclərin qiymətləndirilməsi və icazə verilən xərclərlə müqayisəsi də yerinə yetirilir.** Hər bir funksiya üçün hədəf **xərci indeksi** hesablanır, bu indeks **icazə verilən xərclərin driftinq (faktiki) xərclərə nisbətini** göstərir.

**Ekran**
İndeks = **255 USD / 270 USD ≈ 0.944**
**Performans (prosessor və yaddaş)**
İndeks = **212.5 USD / 210 USD ≈ 1.012**
**Batareya**
İndeks = **170 USD / 180 USD ≈ 0.944**
**Korpus**
İndeks = **127.5 USD / 130 USD ≈ 0.981**
**Əlavə funksiyalar**
İndeks = **85 USD / 90 USD ≈ 0.944**

Ümumi hədəf **xərci indeksi = 850 USD / 880 USD ≈ 0.966**

İndeks dəyəri **1-dən aşağı olan komponentlər (xüsusilə ekran, batareya və əlavə funksiyalar)** həmin sahələrdə xərclərin optimallaşdırılmasının vacibliyini göstərir. Bu, ya daha sərfəli alternativ tədarükçülərin tapılması, ya da istehsal proseslərinin təkmilləşdirilməsi ilə həyata keçirilə bilər.

Hesablamalar əsasında belə bir nəticəyə gələ bilərik ki, məhsulun tənzimlənməsi və yenidən layihələndirilməsi zəruridir. Smartfonun maya dəyərini, məhsul keyfiyyətini və rəqabət qabiliyyətini itirmədən azaltmaq üçün bir neçə konkret tədbir görmək olar (Əmiraslanova, 2019, p. 9-30).

Ən bahalı komponentlərdən biri ekrandır, hazırda onun dəyəri 270 USD təşkil edir. Bu xərci azaltmaq üçün tədarükçülərlə danışıqlar aparmaq və ya yeni istehsalçılar tapmaq mümkündür ki, bu da qiyməti 260 USD-ə qədər endirə bilər. Bu yanaşma, ekranın yüksək keyfiyyətini qoruyaraq ümumi xərcləri azaltmağa kömək edəcəkdir.

Başqa bir əsas xərclərdən biri batareyadır, onun hazırkı qiyməti 180 USD-dir. Bu dəyəri 175 USD-ə endirmək üçün daha sərfəli tədarük şərtlərini nəzərdən keçirmək, yeni tədarükçülər tapmaq və ya istehsal texnologiyalarını təkmilləşdirmək mümkündür.

Smartfonun əlavə funksiyalarını da optimallaşdırmaq mümkündür. Bəzi funksiyalar daha səmərəli şəkildə həyata keçirilə bilər, əsas xüsusiyyətləri qoruyaraq daha az xərc tələb edə bilər. Komponentlərin və onların inteqrasiya üsullarının yenidən nəzərdən keçirilməsi 90 USD olan xərci 85 USD-ə endirməyə kömək edəcəkdir.

Bu dəyişikliklər istehsal xərclərini azaltmağa, smartfonun qiymətini daha çevik etməyə və onu alıcılar üçün daha cəlbedici etməyə imkan verəcəkdir. Maya dəyərinin düzgün idarə edilməsi, xərclərlə bazar gözləntiləri arasında tarazlığı qoruyaraq cihazın iqtisadi səmərəliliyini artıracaqdır.

Cədvəl 6. Verilənlər.

| **Xüsusiyyətlər** | **Qiymət (USD)** |
|---|---|
| Ekran | 260 |
| Performans (prosessor və yaddaş) | 210 |
| Batareya | 175 |
| Korpus | 130 |
| Əlavə funksiyalar (kamera, dizayn və s.) | 85 |
| Ümumi dəyər | 860 |

**Yeni ümumi maya dəyəri** = 260 + 210 + 175 + 130 + 85 = **860 USD**

Bu halda, **860 USD**-lik faktiki maya dəyəri hələ də **850 USD** olan icazə verilən xərci **10 USD** aşır. Buna görə də, **istehsal proseslərinin əlavə təhlili** aparıla bilər və ya **Kaizen xərcləməsi** prinsipləri tətbiq edilə bilər. Bu metodlar istehsal müddətində xərcləri davamlı azaltmağa və daha səmərəli həllər tapmağa imkan verir (Muhasibat.az).

Optimallaşdırma tədbirləri tamamlandıqdan sonra **son maya dəyəri səviyyəsi** – hədəflənən **xərclər** müəyyən edilir. Bu xərclər smartfonun istehsalı üçün çatılması vacib olan maliyyə hədəfləridir.

İstehsalat bölmələri lazımi **texnoloji təlimatları və normativləri** alır, eyni zamanda xərclərə **davamlı nəzarət** mexanizmi təşkil edilir. Bu yanaşma, istehsal prosesindəki mümkün sapmalara vaxtında reaksiya verməyə və planlaşdırılmış maya dəyəri səviyyəsinə nail olmağa imkan yaradır.

**Hədəf göstəriciyə əsaslanan maya dəyəri metodunun biznes qərarlarında tətbiqi**

Biznes qərarlarının qəbulunda **Hədəf göstəriciyə əsaslanan maya dəyəri** aşağıdakı məsələlərin həllinə kömək edir:

- **Qiymətqoyma siyasətinin müəyyən edilməsi** – məhsulun qiymətini istehlakçı gözləntilərinə uyğun olaraq tənzimləmək.
- **Xərclərin azaldılmasına diqqət yetirilməsi** – istehsal prosesində ən çox xərc tələb edən sahələri müəyyən edərək optimallaşdırmaq.
- **Keyfiyyətin idarə edilməsi** – məhsulun dəyəri və funksionallığı arasında optimal balans yaratmaq.

Menecerlər **mühasibat uçotu məlumatlarından** istifadə edərək hansı xərclərin azaldıla biləcəyini və bunun məhsulun istehlakçı üçün dəyərinə təsir etməyəcəyini təhlil edə bilərlər. Beləliklə, **hədəf göstəriciyə əsaslanan maya dəyəri** xərclərə nəzarət etməklə yanaşı, **biznesin bazar şərtlərinə uyğun istiqamətləndirilməsi üçün strateji planlaşdırma aləti** rolunu oynayır (Corporate Finance Institute).

**Hesablamalarla praktiki nümunə**

**İlkin məlumatlara nəzər salaq.** Tutaq ki, şirkət yeni bir məhsul (məsələn, məişət cihazı) istehsal etməyi planlaşdırır və onun bazar qiyməti **1 000 rubl** təşkil edir. Gözlənilən mənfəət norması satış qiymətinin **20%-i** səviyyəsində müəyyən edilib.

**1. Hədəf göstəriciyə əsaslanan maya dəyərinin müəyyən edilməsi**

**Bazar qiyməti 1 000 rubl**
**Mənfəət (20%)** 1 000 × 0.20 = **200 rubl**
**Hədəf göstəriciyə əsaslanan maya dəyəri** 1 000 – 200 = **800 rubl**

Bu o deməkdir ki, müəyyən olunmuş mənfəət səviyyəsinə nail olmaq üçün **istehsal xərcləri 800 rubldan çox olmamalıdır**.

**2. Cari xərclərin analizi**

Cari istehsal dəyəri hesablaması aşağıdakı kimidir

**Xammal və materiallar 400 rubl**
**Əməkhaqqı 250 rubl**
**Avadanlıqların amortizasiyası 80 rubl**
**Dolayı xərclər 120 rubl**
**Cəmi =** 400 + 250 + 80 + 120 = **850 rubl**

Burada faktiki maya dəyərinin **(850 rubl)**, hədəf göstəriciyə əsaslanan maya dəyərindən **(800 rubl) 50 rubl artıq olduğu görünür**.

**3. İdarəetmə qərarlarının qəbulu**

Xərcləri **50 rubl** azaltmaq üçün menecerlər aşağıdakı tədbirləri görə bilərlər.

- **Tədarükçülərlə danışıqlar aparmaq və xammal qiymətini azaltmaq** (məsələn, **30 rubl** qənaət etmək).
- **İstehsal prosesini optimallaşdırmaq**, dolayı xərcləri azaltmaq və ya əmək məhsuldarlığını artırmaqla əməkhaqqı və amortizasiya xərclərini **20 rubl** azaltmaq.

**Nümunə kimi daha yüksək qiymətli məhsula nəzər salaq**

Başqa bir nümunəyə baxaq: tutaq ki, məhsulun **bazar qiyməti 20 000 rubl** təşkil edir.

**Gözlənilən mənfəət (25%)** = 20 000 × 0.25 = **5 000 rubl**
**Hədəf göstəriciyə əsaslanan maya dəyəri =** 20 000 – 5 000 = **15 000 rubl**

**Cədvəl 7.** Cari istehsal dəyəri isə aşağıdakı kimi bölünür.

| Xərc Kateqoriyası | Məbləğ (rubl) |
|---|---|
| Xammal və materiallar | 9 000 |
| Əməkhaqqı | 3 500 |
| Amortizasiya və dolayı xərclər | 3 000 |
| Ümumi dəyər | 15 500 |

**Cəmi** 9 000 + 3 500 + 3 000 = **15 500 rubl**

Burada **500 rubl artıq xərc** müşahidə olunur.

Bu problemi həll etmək üçün şirkət aşağıdakı tədbirləri görə bilər:

- **Materialların alış səmərəliliyini artırmaq.**
- **Texnoloji prosesləri yenidən nəzərdən keçirmək və optimallaşdırmaq.**
- **İşçi qüvvəsi xərclərini azaltmaq üçün avtomatlaşdırmanı tətbiq etmək.**

Bu tədbirlər maya dəyərini optimallaşdırmağa və gözlənilən mənfəət səviyyəsinə çatmağa imkan verəcəkdir (Scribd).

Hədəf göstəriciyə əsaslanan maya dəyərinin tətbiq prosesi xərclərin səmərəli idarə olunmasına və şirkətin rəqabət qabiliyyətinin artırılmasına yönəlmiş bir neçə əsas mərhələdən ibarətdir. İlk növbədə, rəhbərlikdə məhsulun qiymətinin yalnız daxili xərclərlə deyil, bazar şərtləri ilə müəyyən edildiyini anlamaq vacibdir. Bu isə qiymətqoyma yanaşmasının və idarəetmə prioritetlərinin

tədbirlər məzənnə dəyişikliyinə nəzarət strategiyaları sırasındadır. Lakin bu tədbirlərin effektivliyi bilavasitə ümumi iqtisadi mənzərə, inflyasiya templəri və beynəlxalq bazarların vəziyyəti ilə bağlıdır. Hökumətin həyata keçirdiyi müdaxilə siyasəti valyuta tələbi ilə təklifin tarazlaşdırılmasında mühüm rol oynayır.

İnvestisiya nöqteyi-nəzərindən iqtisadi qeyri-müəyyənlik və etibarın itirilməsi Rusiya iqtisadiyyatı üçün ən böyük problemlərdən birinə çevrilib. İnvestorlar sanksiyalar səbəbindən, Rusiya aktivlərinə inamsızlıq səbəbindən alternativ bazarlara üz tutublar. Bu vəziyyət birbaşa xarici investisiyaların ciddi azalması ilə özünü göstərir; bu həm də beynəlxalq şirkətlərin Rusiya bazarından çıxması və ya yeni investisiyalardan imtina etməsi ilə nəticələnir. Buna görə də Rusiyanın valyuta bazarı və investisiya mühiti təkcə milli siyasətlə deyil, həm də qlobal iqtisadi tendensiyalar və beynəlxalq münasibətlərin dinamikası ilə sıx bağlıdır. Sanksiyaların tətbiqi nəticəsində Rusiya iqtisadiyyatının üzləşdiyi çətinliklər, işsizlik oranının artması və onunla əlaqədar sosial problemlərin dərinləşməsi ilə özünü büruzə verir. Qərb ölkələrinin imzaladığı iqtisadi məhdudiyyətlər, xüsusilə bank sektoru, ticarət və enerji sahələrində, iş yerlərinin itirilməsinə və yeni iş imkanlarının yaranmamasına səbəb olmuşdur. İqtisadi aktivliyin tənəzzül etməsi, işsizlik səviyyələrinin yüksəlməsi ilə paralel şəkildə gedir, bu da öz növbəsində sosial gərginliyi artırır. 2023-cü ildə Rusiya üzrə rəsmi işsizlik səviyyəsinin 5-6% olduğu bildirilir, lakin ekspertlər dəqiqliklə qeyd edir ki, faktiki işsizlik, qeyri-rəsmi sektordakı işçi qüvvəsi daxil olmaqla, daha yüksəkdir. İşsizlik artımı ilə birlikdə, bir çox insanın maddi vəziyyəti pisləşir, bu isə sosial problemlərin daha da dərinləşməsinə səbəb olur. İşlərini itirən insanlar, həyat standartlarının aşağı düşməsi ilə üzləşərək, psixoloji stress, depressiya və sosial izolasiya kimi problemlərlə mübarizə aparmağa başlayırlar. Nazirliklərin və sosial xidmətlərin məqsədli təşviqatı ilə belə psixoloji təsirlərin azaldılması mümkün olsa da, bunun uğuru mütəxəssislərin resurslarının durumuna və onların müvafiq sosial dəstək proqramlarını həyata keçirmək qabiliyyətinə bağlıdır. Bir çox ailələr, iş itkiləri nəticəsində maliyyə çətinlikləri ilə mübarizə edir, bu isə onların gündəlik ehtiyaclarını qarşılamaq və qərar vermə imkanı ilə bağlı yollarını daha da məhdudlaşdırır. Ümumiyyətlə, sanksiyalar, yalnız iqtisadi göstəricilərə təsirlə kifayətlənmir, eyni zamanda insanların gündəlik həyatına da ağır yük gətirir. Bu dövrdə Rusiya cəmiyyətinin qarşılaşdığı işsizlik və sosial problemlər əhəmiyyətli dərəcədə dərinləşərək, insanların psixoloji durumlarını mənfi qarşılıqlı təsir altında saxlayır. Nəticədə, Rusiya hökumətinin, bu problemlərin həlli yönündə atdığı addımlar, yalnız iqtisadi bərpa üçün deyil, eyni zamanda sosial sabitlik və özünü güvən hissini təmin etmək üçün həyati əhəmiyyət kəsb edir. Gələcək inkişaf üçün sosial siyasətin doğru müəyyən edilməsi, işsizliyin azaldılması və sosial davamlılığın təşviqi, ölkənin iqtisadi müstəqilliyinin bərpasında müstəsna rol oynayacaqdır.

## Nəticə

Sanksiyalar Rusiya iqtisadiyyatına çoxşaxəli və dərin təsirlər göstərmişdir. Enerji, maliyyə və xarici ticarət sahələrində tətbiq olunan məhdudiyyətlər iqtisadi artımı ləngitmiş, istehsalatda geriləməyə və işsizlik səviyyəsinin yüksəlməsinə səbəb olmuşdur. Xarici investisiyaların azalması, texnologiya transferinin məhdudlaşdırılması və rubldəki dəyər itkisi ölkənin iqtisadi dayanıqlığını zəifltəmişdir. Yerli istehsal təşviq olunsa da, bu, beynəlxalq standartlara uyğunluqda problemlər yaratmışdır. Sanksiyalar yalnız iqtisadi deyil, həm də sosial təsirlərə yol açaraq əhalinin rifah səviyyəsini aşağı salmış və psixoloji gərginliyi artırmışdır. Rusiya iqtisadiyyatının gələcək sabitliyi hökumətin düzgün sosial-iqtisadi strategiyalar tətbiq etməsindən asılı olacaqdır.

## Ədəbiyyat

1. Bhardwaj, A., Sharma, S. (2025). *The impact of sanctions on ADR in international commercial disputes: Legal frameworks and challenges*. Available at SSRN 5128298.

from https://www.statista.com/statistics/998954/russia-goods-services-exports-share-of-gdp/
2. Gunawan, A. F. (2025). Analysis of palm oil plantation regional regulation implementation in Bangka Belitung from an economic law perspective. *Law and Economics*, 19(1), 11–23. https://www.statista.com/statistics/1034825/russia-goods-services-imports-share-of-gdp/ https://www.statista.com/statistics/263772/gross-domestic-product-gdp-in-russia/
3. Kulikova, I. V., Roshchina, L. N., Ukraintseva, I. V. (n.d.). Prospects for Russian-Indian cooperation trade and economic cooperation in the context of sanctions. *Progressive Economics*, 64.
4. Mustafoyev, G. S., Maxmudov, S., Ulugmurodov, F. F. (2025). Economic fluctuations and sectoral growth in Iran: A decade of challenges and opportunities (2010-2021). *International Journal on Economics, Finance and Sustainable Development*, 7(1), 43–46.
5. Roberts, O. (2025). *Investigating the effects of economic sanctions on small businesses*.
6. Statista. (2025, April 1). Exports of goods and services as a share of GDP in Russia from 2010 to 2023.
7. Statista. (2025, April 1). Gross domestic product (GDP) in Russia from 1997 to 2023, with projections until 2029.
8. Statista. (2025, April 1). Imports of goods and services as a share of GDP in Russia from 2010 to 2023.

Daxil oldu: 19.11.2024
Qəbul edildi: 21.02.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/140-142

**Aytən Kişiyeva**
Azərbaycan Dövlət Pedoqoji Universiteti
magistrant
https://orcid.org/0009-0001-0806-4880
aytenkisiyevaa@gmail.com

# Müasir ingilis dili müəllimlərinin didaktik yanaşmalarının müqayisəsi: ənənəvi və interaktiv metodlar

### Xülasə

Ənənəvi və interaktiv tədris metodları ingilis dili müəllimlərinin istifadə etdiyi əsas yanaşmalardır. Ənənəvi metodlar müəllim yönümlü olub, biliklərin birbaşa ötürülməsi və təkrara əsaslanır, halbuki interaktiv metodlar tələbə yönümlüdür və ünsiyyətə, əməkdaşlığa əsaslanır. İnteraktiv metodlar konstruktivizm və kommunikativ dil tədrisi nəzəriyyələrinə əsaslanaraq, şagirdlərin dili praktik şəkildə mənimsəməsini təşviq edir. Ənənəvi metodlar strukturlaşdırılmış öyrənməni təmin etsə də, interaktiv yanaşmalar şagirdlərin fəal iştirakını və real ünsiyyət bacarıqlarının inkişafını dəstəkləyir. Müasir ingilis dili tədrisində hər iki metodun balanslı tətbiqi daha effektiv öyrənmə mühiti yaradır.

***Açar sözlər:*** *ənənəvi metodlar, interaktiv tədris, kommunikativ yanaşma, fəal öyrənmə, dil bacarıqları*

**Ayten Kishiyeva**
Azerbaijan State Pedagogical University
Master student
https://orcid.org/0009-0001-0806-4880
aytenkisiyevaa@gmail.com

# The Comparison of Didactic Approaches of Modern English Language Teachers: Traditional and Interactive Methods

### Abstract

Traditional and interactive teaching methods are the main approaches used by English language teachers. Traditional methods are teacher-centered, focusing on direct knowledge transfer and repetition, while interactive methods are student-centered, emphasizing communication and collaboration. Interactive methods, based on constructivism and communicative language teaching theories, encourage students to actively engage with the language. Traditional methods ensure structured learning, but interactive approaches support the development of students' communication skills and active participation. A balanced application of both methods creates a more effective learning environment in modern English language teaching.

***Keywords:*** *traditional methods, interactive teaching, communicative approach, active learning, language skills*

## Giriş

Müasir təhsil sistemində ingilis dili tədrisi mühüm yer tutur və müxtəlif tədris metodları ilə şagirdlərin dil bacarıqları inkişaf etdirilir. Ənənəvi və interaktiv metodlar bu sahədə ən geniş istifadə olunan yanaşmalardır. Ənənəvi metodlar, əsasən müəllim yönümlü yanaşmalarla biliklərin ötürülməsinə, təkrara və strukturlaşdırılmış öyrənməyə əsaslanır. İnteraktiv metodlar isə tələbə yönümlüdür, şagirdlərin fəal iştirakını və real həyatda dil bacarıqlarını inkişaf etdirməyə yönəlir. Bu iki yanaşmanın müqayisəsi, müasir ingilis dili tədrisinin daha effektiv yollarını tapmağa kömək edir.

**Tədqiqat**

Ənənəvi və interaktiv tədris metodları ingilis dili tədrisində əsas yanaşmalardır və hər biri

 

özünəməxsus xüsusiyyətlərə malikdir. Ənənəvi metodlar əsasən müəllim yönümlü yanaşmalarla xarakterizə olunur, burada müəllim əsas məlumat mənbəyidir və şagirdlər əsasən passiv rol oynayır (Harmer, 2007). Bu yanaşmada şagirdlərə biliklər təkrarla, mexaniki şəkildə öyrədilir və müəllim dərsin mərkəzində dayanır. Bu metodlar, xüsusən dilin strukturu və qrammatikasının öyrədilməsi sahəsində effektiv olsa da, şagirdlərin dilin praktik istifadəsində və ünsiyyət bacarıqlarında çətinliklər yarada bilər. İnteraktiv metodlar isə daha çox tələbə yönümlüdür və şagirdlərin fəal iştirakını təşviq edir, onların öyrənmə prosesində aktiv rol almasını təmin edir (Richards, Rodgers, 2001). Bu metodlar sosial qarşılıqlı əlaqəyə, müzakirələrə, qrup və cüt işlərinə əsaslanır və şagirdlərə dili real həyatda istifadə etməyə imkan verir. İnteraktiv yanaşma, şagirdlərin ünsiyyət bacarıqlarının inkişafına, həmçinin analitik düşünmə və problemlərin həll edilməsinə yönəlir (Larsen-Freeman, 2000). Müasir təhsil sistemində bu metodların sintez olunması, şagirdlərin fərdi ehtiyaclarına uyğun tədris mühiti yaratmağa kömək edir. Həmçinin, hər iki yanaşma müəyyən hallarda birləşdirilərək daha balanslı və effektiv tədris təcrübəsi təmin edə bilər.

**Ənənəvi metodların üstünlükləri və çatışmazlıqları**

Ənənəvi tədris metodları uzun illər ərzində dil tədrisində geniş istifadə olunmuş və bir sıra üstünlüklərə malikdir. Bu metodların əsas üstünlüyü, müəllimin dərsi daha sərbəst idarə edə bilməsidir. Müəllim dərsin mərkəzində dayanır, şagirdlər isə passiv şəkildə məlumatları qəbul edirlər (Richards, 2015). Bu yanaşma, xüsusilə dilin strukturunun öyrədilməsində çox təsirli ola bilər, çünki şagirdlərə dil qaydaları təkrarla və ardıcıllıqla təqdim olunur. Ənənəvi metodlar sinif idarəetməsində də asanlıq təmin edir, xüsusilə böyük siniflərdə müəllimlər şagirdlərin hərəkətini izləyərək dərsi asanlıqla davam etdirə bilirlər.

Bununla yanaşı, ənənəvi metodların bəzi ciddi çatışmazlıqları da mövcuddur. Ən böyük problem, şagirdlərin passiv öyrənməsi və onların tədris prosesində aktiv iştirak etməməsidir (Browne, 2005). Bu yanaşma, şagirdlərin analitik və yaradıcı düşünmə bacarıqlarını inkişaf etdirmir, çünki onların rolü yalnız müəllimdən gələn məlumatı qəbul etməkdir. Həmçinin, ənənəvi metodlar şagirdlərin sosial bacarıqlarını inkişaf etdirməyə kömək etmir, çünki bu metodda qarşılıqlı əlaqələr, müzakirələr və qrup işi azdır. Bu metodun digər çatışmazlığı isə dilin real həyatda istifadəsinə yönəlmiş deyil, bu da şagirdlərin dil bacarıqlarını gündəlik həyatda istifadə etməkdə çətinlik çəkmələrinə səbəb ola bilər.

Son olaraq, ənənəvi metodların zamanla daha az təsirli olması da əsas çatışmazlıqdır. Müasir tələbələrin daha dinamik və interaktiv öyrənmə ehtiyaclarına uyğun olaraq, ənənəvi metodların tətbiqi, xüsusilə texnologiyanın və interaktiv yanaşmaların geniş tətbiq olunduğu müasir təhsil sistemində, daha az təsirli ola bilər (Swan, 2006). Bu səbəbdən ənənəvi metodların yalnız struktur və qaydalara diqqət yetirən yanaşmalar olaraq qaldığı halda, daha interaktiv və praktik metodların inkişaf etdirilməsi zəruridir.

**İnteraktiv metodların üstünlükləri və çatışmazlıqları**

İnteraktiv metod, şagirdlərin dərslərdə fəal iştirakını təmin edərək, onların dil bacarıqlarını və sosial kommunikasiya qabiliyyətlərini inkişaf etdirir. Bu metod müzakirələr, qrup işləri və rol oyunları vasitəsilə şagirdlərə real həyatda dili istifadə etmə imkanı yaradır. İnteraktiv yanaşma, şagirdlərin analitik düşünmə qabiliyyətlərini gücləndirir və onlara dilin təbii şəraitdə tətbiqini öyrədir. Beləliklə, bu metod şagirdlər arasında əməkdaşlığı artırır və onları daha motivasiya edir, həm də tədrisin maraqlı və cəlbedici olmasına kömək edir (Richards  Rodgers, 2001).

Bununla yanaşı, interaktiv metodlar əlavə resurs və zaman tələb edir. Sinifdə idarəetmə çətinlikləri meydana gələ bilər, xüsusilə böyük və müxtəlif səviyyəli qruplarda. Həmçinin, bəzən şagirdlərin hər biri metodun tələb etdiyi fəallığı göstərməyə hazır olmaya bilər və bu da dərsin effektivliyini azalda bilər. Bu səbəbdən, interaktiv metodların tətbiqi zamanı müəllimin sinif idarəetmə bacarıqları və dərs planlaması çox önəmlidir (Harmer, 2007). Nəticədə, bu yanaşma şagirdlərin dil biliklərini inkişaf etdirə bilər, amma düzgün şəkildə tətbiq edilməsi tələb olunur.

**İngilis dili tədrisində ənənəvi və interaktiv metodların müqayisəsi**

Ənənəvi və interaktiv metodlar ingilis dili tədrisində fərqli yanaşmalar təklif edir. Ənənəvi metodda müəllim dərsi idarə edir və şagirdlər passiv şəkildə məlumatları qəbul edirlər. Bu metod əsasən dilin strukturlarını öyrətməyə yönəlir, lakin şagirdlərin aktiv iştirakını və analitik düşünmə

bacarıqlarını inkişaf etdirmir (Harmer, 2007). İnteraktiv metod isə şagirdlərin fəal iştirakını təşviq edir, müzakirələr və qrup işləri vasitəsilə dil bacarıqlarını inkişaf etdirir. Bu metod, şagirdlərin real həyatda dili daha yaxşı istifadə etmələrini təmin edir (Bates, 2015).

Bununla belə, ənənəvi metodlar sinifdə nizamı təmin etməkdə asan olsa da, şagirdlərin marağını azaltdığı və onların sosial bacarıqlarını inkişaf etdirmədiyi üçün çatışmazlıqlara malikdir. İnteraktiv metodlar isə daha çox resurs və zaman tələb edir, həmçinin sinif idarəetməsi baxımından çətinliklər yarada bilər (Gagne, 2010). Hər iki metodun balanslı şəkildə birləşdirilməsi isə daha effektiv tədris nəticələri əldə etməyə imkan verir.

**Müasir ingilis dili müəllimləri üçün optimal metodun seçilməsi**

Müasir ingilis dili tədrisində optimal metodun seçilməsi, şagirdlərin müxtəlif öyrənmə tərzləri və tədris məqsədləri nəzərə alınaraq həyata keçirilməlidir. Ənənəvi və interaktiv metodların hər biri özünəməxsus üstünlüklər və çatışmazlıqlar təqdim edir. Ənənəvi metod, dilin strukturunu və qaydalarını sistematik şəkildə öyrətməkdə effektiv olsa da, şagirdlərin ünsiyyət və sosial bacarıqlarını inkişaf etdirməkdə çətinlik yaradır (Harmer, 2007). İnteraktiv metodlar isə şagirdlərin fəal iştirakını və praktiki dil istifadəsini təşviq edərək, onların analitik və ünsiyyət bacarıqlarını artırır, amma resurs və vaxt baxımından daha çox tələb edir (Johnson, Johnson, 1999). Müəllimlər, hər iki metodun üstünlüklərini birləşdirərək, şagirdlərin həm dil qaydalarını mənimsəmələrinə, həm də real həyatda dili istifadə etmə bacarıqlarını inkişaf etdirmələrinə imkan yarada bilərlər (Richards, Rodgers, 2001). Bu yanaşma, müəllimə dərsləri daha dinamik və fərdi ehtiyaclara uyğunlaşdırmaq imkanı verir, nəticədə tədris effektivliyi artır.

## Nəticə

Bu məqalədə ənənəvi və interaktiv tədris metodlarının müqayisəsi və müasir ingilis dili müəllimləri üçün optimal metodun seçilməsi məsələləri araşdırılmışdır. Hər iki metodun öz üstünlükləri və çatışmazlıqları vardır. Ənənəvi metod dilin strukturunun öyrədilməsi üçün faydalıdır, lakin şagirdlərin ünsiyyət bacarıqlarını inkişaf etdirməkdə məhdudiyyətlər yaradır. İnteraktiv metodlar isə şagirdlərin fəal iştirakını və praktiki dil istifadəsini təşviq edir, lakin daha çox resurs və zaman tələb edir. Optimal nəticələr üçün hər iki metodun balanslı istifadəsi tövsiyə olunur.

## Ədəbiyyat

1. Bates, T. (2015). *Teaching in a Digital Age.* Tony Bates Associates.
2. Brown, H. D. (2001). *Teaching by Principles: An Interactive Approach to Language Pedagogy.* Pearson Education.
3. Browne, A. (2005). *Teaching English as a Foreign Language.* Routledge.
4. Ellis, R. (2003). *Task-Based Language Learning and Teaching.* Oxford University Press.
5. Gagne, R. M. (2010). *The Conditions of Learning and Theory of Instruction.* Pearson Education.
6. Harmer, J. (2007). *The Practice of English Language Teaching.* Pearson.
7. Johnson, D. W. (2006). *Cooperative Learning: The Kinds of Knowledge and the Skills that Matter.* Prentice Hall.
8. Johnson, D. W., Johnson, R. T. (1999). *Cooperative Learning: The Kinds of Knowledge and the Skills that Matter.* Prentice Hall.
9. Richards, J. C., Rodgers, T. S. (2001). *Approaches and Methods in Language Teaching.* Cambridge University Press.
10. Scrivener, J. (2011). *Learning Teaching: The Essential Guide to English Language Teaching.* Macmillan.
11. Warschauer, M. (2000). *Language and the Internet.* Cambridge University Press.

Daxil oldu: 18.11.2024
Qəbul edildi: 20.02.2025

***ELMİ İŞ*** **Beynəlxalq Elmi Jurnal. 2025 / Cild: 19 Sayı: 4 / 143-147** **ISSN: 2663-4619**
***SCIENTIFIC WORK*** **International Scientific Journal. 2025 / Volume: 19 Issue: 4 / 143-147** **e-ISSN: 2708-986X**

DOI: https://doi.org/10.36719/2663-4619/114/143-147

**Natiqə İbrahimli**
Bakı Slavyan Universiteti
magistrant
https://orcid.org/0009-0007-2811-4981
theibrahimli94@gmail.com

# Dil tədrisində istifadə olunan ən son informasiyalar

**Xülasə**

İngilis dilinin tədrisində istifadə olunan ən son məlumatlar və metodlar, texnologiyanın və tədris yanaşmalarının inkişafı ilə əlaqəli olaraq dəyişir. Müasir dil tədrisi, rəqəmsal texnologiyaların daha geniş istifadə edilməsini tələb edir. Online dərslər, interaktiv tədris platformaları, tətbiqlər (məsələn, Duolingo, Babbel) və süni intellekt (AI) texnologiyaları ilə dərslər daha çevik və fərdiləşdirilmiş hala gəlib. Müəllimlər, Zoom, Microsoft Teams və digər virtual alətlərdən istifadə edərək dərsləri onlayn keçirlər. Dil öyrənmə prosesində, şagirdlər yalnız qrammatika qaydalarına deyil, həm də dilin gündəlik həyatda necə istifadə olunduğuna diqqət yetirirlər. Bu sahədəki yeniliklər və texnoloji inkişaflar, dil tədrisinin daha effektiv, əhatəli və şagirdin ehtiyaclarına uyğun hala gəlməsini təmin edir.

***Açar sözlər:*** *ingilis dili, müasir texnologiyalar, qloballaşma, bilik və bacarıq, təlim və tədris*

**Natiga Ibrahimli**
Baku Slavic University
Master student
https://orcid.org/0009-0007-2811-4981
theibrahimli94@gmail.com

# The Latest Information Used in Language Teaching

**Abstract**

The latest information and methods used in English language teaching change with the development of technology and teaching approaches. Modern language teaching requires a wider use of digital technologies. With online classes, interactive learning platforms, applicatons (eg Duolingo, Babbel) and artificial intelligence (AI) technologies, lessons have become more flexible and personalized. Teachers conduct lessons online using Zoom, Microsoft Teams and other virtual tools. In the language learning process, students focus not only on grammar rules, but also on how the language is used in everyday life. Innovations and technological developments in this field ensure that language teaching becomes more effective, comprehensive and adapted to the needs of the learner.

***Keywords:*** *english language, modern technologies, globalization, knowledge and skill, training and teaching*

## Giriş

Hal-hazırda texnologiya gündəlik həyatımızı idarə edən həyat nüvəsidir. Son zamanlar cəmiyyətimizdə baş verənlər texnologiya sahəsindəki tərəqqi və yeniliklərlə bağlıdır. Texnologiya "yeni tip məktəblər" üçün bir zərurətdir, çünki texnologiyanın istifadəsi təlim, tədris keyfiyyətinin yüksəldilməsi, məhsuldarlığın, səmərəliliyin artırılması, təhsildə münasibət mübadiləsinin qurulması, peşə inkişafı və kadr profilinin uyğunluğunu özündə cəmləşdirir. Qloballaşma bütün dünyada İngilis dilinin xüsusiyyətlərini və əhəmiyyətini artırdı. Dilin tədris olunmasında texnologiyanın sürətli inkişafı bir çox məsələlərdə öz cavabını tapmayan yeni sualların yaranmasına səbəb oldu. Texnologiyanın tətbiqi İngilis dilində tədris metodlarını xeyli dəyişdi. Tədrisin

irəliləməsi baxımından maraqlı və daha məhsuldar olması kimi bir çox alternativlər önə sürdü. Multimedia texnologiyası və onun İngilis dilinin tədrisində tətbiqi, xüsusilə də təhsildə dilin ünsiyyət vasitəsi kimi kontekstdə daha güclü və təsirli bir vasitə kimi əsas göstərici hesab olunur. Bunun üçün də artıq ənənəvi üsullarla deyil, tədrisin müasir texnologiyalar ilə zənginləşdirilməsi əsas götürülməlidir.

Müasir texnologiyaların tətbiqi konsepsiyası ilə tanışlıq yalnız müasir cihaz və proqramların istifadəsi ilə məhdudlaşmır, əksinə daha sürətli və hərtərəfli öyrənmə inkişafını asanlaşdıran innovativ sistem və tədris metodlarının tətbiqini əldə edir. Mövcud pedaqoji nəzəriyyələrə görə, texnologiyanın öyrənmə potensialından istifadə etməklə şagirdlər öz dil biliklərini və bacarıqlarını daha yaxşı əldə edə bilirlər. İngilis dilinin tədrisində texnologiyanın istifadəsi tələb olunan nəticələrə nail olmaqla tələbələrə fayda gətirən müasir vasitələr sisteminin və digər komponentlərlə birləşməsinin özündə birləşdirir. İngilis dili tədrisində müasir texnologiyaların istifadəsi, xüsusən də çoxsaylı sahələr və fənlər üzrə görünməmiş inkişaflar fonunda əvəzsiz hala gəlir. İngilis dili tədrisini optimallaşdırmaq və müəllimlər təhsil sektorunun kompüterləşdirmə, multimediya qurğuları, mobil telefonlar, audio-vizual effekt tətbiqləri və sosial media kimi müasir texnoloji vasitələr tətbiq etməklə qlobal texnoloji inqilabdan yayınmaması vacibdir. İnternet asanlıqla, dərhal və demək olar ki, məhdudiyyətsiz bir proqram təminatına, tətbiqlərə və İngilis dilinin tədrisini və öyrənməsini sürətləndirə bilən köməkçi platformalara və materiallara giriş əldə edir. Bu mənfəətlər hamı üçün geniş ola bilsə də, müəllimlərin tez-tez fərqli vasitələrin və tədris metodlarının işlədilməsində əsas rol oynadığı xüsusi qeyd olunmalıdır. Üstəlik, bir çox bu cür proqramlar, eyni zamanda şagirdlərin anlama və İngilis dili biliklərinə yiyələnmələri zamanı effektiv İngilis dilinin tədrisini təşviq etmək üçün hazırlanmışdır (Abbasova, 2014).

**Tədqiqat**

Elmin genişləndirilmiş dünyagörüşü təhsildə yeni yanaşmalar aşkar edir. Yaradıcılıq və öyrənmə üzrə aparıcı elm mütəxəssisi professor R. Keith Sawyerin apardığı araşdırma, dərin öyrənməyə səbəb olan təcrübələr verməklə texnologiyanın akademiyaya təsir etmək və inkişaf etdirmək gücünü vurğulayır. Bunlara tələbələrə birgə öyrənməyə, modelləri sınamağa və yenidən dizayn etməyə və biliklərini həm vizual, həm də şifahi şəkildə ifadə etməyə imkan vermək daxil edilir. Mütəxəssislər, öyrənmənin arxasında duran insan psixologiyasının zaman keçdikcə çox dəyişmədiyini düşündüyünə baxmayaraq, yeni materialı dərk etməyimiz, saxlamağımız və almağımıza təsir edən xarici amillər daim inkişaf edir. Rəqəmsal inqilab sürətləndikcə texnologiya bizə öyrənmə təcrübələrini formalaşdırmaq və öyrənmə məqsədlərinə çatmaq üçün maraqlı imkanlar verir. Təhsil sektorunda texnoloji irəliləyişlər və yeniliklər gözə çarpan təsir bağışlayır və bir çox ssenarini dəyişdirir. İKT sözünə kompüter, mobil telefon, radio, televiziya və peyk sistemi kimi hər hansı bir rabitə cihazı daxildir. İnternet imkanları ilə əlaqəlidir (Ağazadə, 1974).

İndi texnologiyanın İngilis dilinin tədrisi üçün bir vasitə kimi rolu və istifadəsi getdikcə artır, çünki müəllimlər tələbələrin İngilis dilini çox asanlıqla öyrənə biləcəkləri həm müstəqil, həm də birgə öyrənmə mühiti yaratmaq qabiliyyətini başa düşmüşlər. Tədris və təlim prosesində İKT-nin istifadəsi bir saata ehtiyac duyur və müəllimin İKT inteqrasiyası ilə tədris tədris prosesində yenilikçi və həvəsli olacağı gözlənilir. Müəllim təhsili yaymaqda texnologiyadan istifadə etməyi düşünməlidir. İngilis dilinin tədrisində müasir texnologiyaların istifadəsi, İngilis dilinin tədrisi ilə bilavasitə əlaqəli və arzu olunan məqsədə çatmağa səbəb olan metodların, vasitələrin, materialların, cihazların, sistemlərin və strategiyaların innovativ tətbiqini əhatə etmək üçün geniş şəkildə başa düşülür. Beləliklə, indi texnologiya ümumiyyətlə bir sıra tədris və öyrənmə kontekstində vacib bir təhsil və köməkçi vasitə kimi İngilis dilinin tədrisində xüsusi rolu var, çünki pedaqogikanın həm məzmununu, həm də çatdırılmasını artırmaq üçün bir sıra potensial imkanlar verir (Abbasova, 2015).

Müasir texnologiyaların tətbiqi konsepsiyası ilə tanışlıq yalnız müasir cihaz və cihazların istifadəsi ilə məhdudlaşmır, əksinə daha sürətli və hərtərəfli öyrənmə inkişafını asanlaşdıran innovativ sistem və tədris metodlarının tətbiqini əldə edir. Mövcud pedaqoji nəzəriyyələrə görə, texnologiyanın öyrənmə potensialından istifadə etməklə şagirdlər öz dil biliklərini və bacarıqlarını daha yaxşı əldə edə bilirlər. Tədris prosesində təlim keyfiyyətinin artırılması məqsəd əsas

götürülərək tətbiq olunan interaktiv metodlarından istifadə İKT və digər vasitələr önəmli rol oynayır. İnformasiya-kommunikasiya texnologiyalarının tədrisdə tətbiqi müxtəlif dərs formalarının həyata keçirilməsi və bu zaman pedaqoji şərtlərin formalaşdırılmasına imkan vermişdir. Texnologiyanın istifadəsi həm sinif daxilində, həm də sinif xaricində təlim prosesinin vacib hissəsinə çevrilmişdir. Texnologiya təhsildə məhsuldarlığın əhəmiyyətli dərəcədə yaxşılaşdırılmasına nail olmaq üçün ayrılmaz fundamental struktur dəyişikliklərini tələb edir. Həm tədrisə, həm də öyrənməyə dəstək olmaq üçün istifadə olunan texnologiya, sinif otaqlarını kompüterlər və əl cihazları kimi rəqəmsal təlim vasitələri ilə təchiz edir, kurs təcrübələrini və tədris materiallarını genişləndirir, gündə 24 saat, həftənin 7 günü öyrənməyi dəstəkləyir, tələbə fəallığını və motivasiyasını artırır, öyrənməyi sürətləndirir. Texnologiya, eyni zamanda, əlaqəli tədrisin yeni bir modelinə yiyələnməklə tədrisi dəyişdirmək gücünə malikdir. Bu model müəllimləri şagirdlərinə və peşə məzmununa, mənbələrə və sistemlərə öz təlimlərini inkişaf etdirməyə və öyrənməyi fərdiləşdirməyə kömək edir. Texnologiya öyrənmə təcrübəsini dəyişdirir. Müasir texnologiyalar smartwatch və smartfon kimi çox funksiyalı qurğulara yol açdı. Kompüterlər əvvəlkindən daha sürətli, daha portativ və daha yüksək gücə malik oldu. Bütün bu inqilablarla texnologiya həyatımızı daha asan, daha sürətli, daha yaxşı və əyləncəli hala gətirdi. İKT sahəsində savad müasir texnoloji cəmiyyətimizdə həyat üçün əsasdır. Tələbələri həyatı boyu öyrənən və 21-ci əsrin qlobal vətəndaşları olmaq üçün İKT-ni həm İngilis tədris planına, həm də İngilis dili pedaqoji təcrübəsinə uğurla daxil etməliyik. İKT tədris və öyrənmə qabiliyyətini artırmaq üçün dəyərli bir vasitədir. Müəllimlər üçün İKT peşəkar bir qaynaqdır: sinif təhvili rejimi, etibarlı və qiymətli mətn tiplərinin mənbəyidir. Biliklərin axtarışı və idarə olunması ilə əlaqəli bəzi ümumi istifadə olunan İKT vasitələrinə qrup Epoçt, telekonfrans, video konfrans, söhbət, forum, qrup proqram təqvimi, paylaşılan məlumat fəzalarında iş axını idarəetmə sistemi, qrup qərarı kimi Rabitə və Əməkdaşlıq sistemləri daxildir. Eynilə, sənədlərin idarəetmə sistemləri, məzmun idarəetmə sistemləri, internet, axtarış motorları, kompüter və google, habele dərsdən sonra müəllimlə əlaqə yaratmaq üçün e-poçt, sosial şəbəkə saytlar, mesajlaşma, bundan savayı mobil tətbiqetmələr, onlayn lüğətlər, radio, televiziya, kabel, nişanlar, CD, DVD və digər yüksək əlçatan məlumatlara əsaslanan alt sistemləri dil tədrisi və öyrənməsində faydalıdır (Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası, 2013).

İngilis dilinin populyarlığı gündən-günə genişləndikcə, İngilis dili müəllimləri dilləri öyrətmə metodlarında dəyişiklik ehtiyacını hiss edirlər, lakin müəllimlərin əksəriyyəti hələ də ənənəvi qaydada dərs deyir. İngilis dili ilə ayaqlaşmaq tədrisdə daha çox uyğunluq və uğur qazanmaq üçün onlar multimedia dünyasına çıxmaq məcburiyyətindədirlər. İngilis dili tədrisini asanlaşdıran vasitələr onlayn İngilis dili anlayışını yaradıb ki, veb saytları, elektron lüğətləri, kompüterlə işləyən dil tədris proqramlarını, təqdimat proqramlarını, müxtəlif söhbət və e-poçt mesajlaşma proqramlarını, CD pleyerləri dinləmək, çox sayda YouTube və digər videokliplər, virtual konfransların təşkil olunmasının inkişafına gətirib çıxartdı. Multimedia texnologiyası dedikdə insanların həm fikirlərini bölüşmələrinə imkan verən həm qurğudan, həm də əşyalardan istifadə edən kompüter əsaslı interaktiv tətbiqlər, mətn, qrafika, animasiya, video və səsin birləşməsi aiddir (Abbasova, 2010, s. 51).

XXI əsr qloballaşma və informasiya texnologiyaları əsridir. Harry Samuels'in iddia etdiyi kimi: "Son vaxtlar sosial mediada və informasiya texnologiyalarında baş verən hadisələr xarici dildə təhsili yeni istiqamətlərə aparır. İngilis dili dünyanın ən vacib ünsiyyət vasitələrindən biridir, belə ki, bu dili öyrənmək vacibdir" (Hüseynzadə, 2009, s. 30). Nəticədə İngilis dili tədrisi təhsildə vacib mövzulardan biridir.

Texnologiya ilə əlaqəli sinif, kompüter laboratoriyası və ya tədris mərkəzi günümüzdə daha da inkişaf etdirilir. Artıq onlayn təhsil, distant təhsil dövrümüzdə getdikcə daha aktual hal alır deyə bilərik, əlbəttə ki, bunun təhsilin keyfiyyətində müsbət və mənfi cəhətləri vardır. Ancaq həqiqət budur ki, bu günün texnologiyaları ilə İngilis dilini evdə, idman salonunda, maşın sürərkən və ya faktiki olaraq hər yerdə kiçik bir kompüter, mobil cihaz və ya İnternetə qoşulmaqla doğru resursları əldə etməklə İngilis dili təhsilini eyni dərəcədə yaxşı davam etdirə bilər. Biz artıq siniflə məhdudlaşmırıq. Rabitə və kompüter texnologiyaları inkişaf etdikcə kiçik və daha çox mobil, kiçik

ölçülü mobil rəqəmsal media cihazları tədris vasitəsinə çevrilir. Müasir İngilis dili müəllimlərinin əksəriyyəti hazırda optimal tədrisi asanlaşdırmaq üçün hazırlanmış bir sıra texnoloji vəsaitləri fəal şəkildə birləşdirirlər. Cari tədqiqat, buna görə də son elmi və texniki inkişafları tətbiq edən, tədrisçilərini fənni səmərəli və keyfiyyətli çatdırmağı təmin edən texnoloji bacarıqlarla təchiz edən, audio-vizual və müasir texniki media ilə təmin edən innovativ tədris planlarını hazırlamaqla İngilis dilində tədrisdə istifadə olunan texnologiyanın müxtəlif elementlərinə toxunur. Metodikada dil öyrənmənin ən önəmli yanaşma yolu dili kəşf edərək öyrənməkdir. Müasir texnologiyalara əsaslanan dil tədrisində dilin əsasən yerli dil daşıyıcıları ilə ünsiyyət quraraq öyrənilməsi əsas prioritet hesab olunur. Bu baxımından tələbələr internet vasitəsilə sinxron və qeyri-sinxron ünsiyyət vasitələrindən istifadə edərək öz dil bacarıqlarını inkişaf etdirə bilərlər.

Dünyanın təhsil tarixində uzun illər yaddaş məktəbi insanların xidmətində olmuş, əsrlər boyu onların inkişafını şərtləndirmişdir. Yaddaş məktəbinin mahiyyətində akademik biliklər vermək, şagirdləri öyrəndiklərinin həcminə görə dəyərləndirmək üstün yer tutmuşdur. Bu gün sosial mühit dəyişmiş, insanların düşüncə, idrak bacarıqlarına, yaradıcılıq qabiliyyətlərinə ehtiyac yaranmışdır. Belə ki, müasir dövrdə məktəbin, bütövlükdə təhsilin funksiyası dəyişir. Müasir məktəbin şagirdlərinin nailiyyəti kreativ bacarıqlarının səviyyəsi ilə ölçülür. Azərbaycan məktəblərində də bu keyfiyyətlərin olması məntiqə uyğun bir zərurət kimi özünü büruzə verir. Bu səbəbdən də "Azərbaycan 2020: Gələcəyə baxış - İnkişaf Konsepsiyası" şagirdlərin idrak fəallığını, ümumi inkişafını ləngidən mövcud "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktəbi"nə keçidin təmin olunması məqsədilə sistemli tədbirlərin həyata keçirilməsini nəzərdə tutur. Dövlət Strategiyasında strateji hədəflərdən biri də "səriştə əsaslı ümumi təhsil standartları və kurikulumlarının hazırlanması"dır. Bu isə öz növbəsində standartların kurikulumların strukturundan çıxarılaraq təkmilləşdirilməsi və ayrıca təqdim olunması zərurətini meydana qoyur. Qlobal dünyada təhsilə qoyulan ümumi tələblərdən biri də onun standartlaşdırılmasıdır. İstər təhsil səviyyəsi, istərsə də ayrı-ayrı fənlər üçün müəyyən olunmuş bu standartlarda şagirdlərin sadəcə əldə edəcəkləri bilik və bacarıqlar deyil, onların şəxsiyyətini keyfiyyət cəhətdən müəyyən edən qabiliyyətlər ifadə olunur. Bunlar artıq müasir təhsil məkanında səriştələr (kompetensiyalar) kimi geniş şəkildə işlənməkdədir. Bu səriştələr şagirdlərdə idraki, hissi-emosional və psixomotor bacarıqlar əsasında formalaşır. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə-əldə edilmiş bilik və bacarıqları praktik fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir.

Tənqidi təfəkkürün inkişaf etdirilməsi, şagirdlərdə əməkdaşlıq və yaradıcılıq qabiliyyətlərinin üzə çıxarılması və formalaşdırılması kimi əhəmiyyətli vəzifələrdən biri də şagirdlərə kommunikativ kompetensiyaların aşılanmasıdır. Kommunikasiya bacarıqları öyrənmə prosesini asanlaşdırır, tələbə və müəllim münasibətlərini daha da möhkəmləndirir. Bu bacarıq özündə tələbələr tərəfindən fikir və ideyaların danışıq və yazı yolu ilə aydın və effektiv ifadə edilməsini, kommunikasiya axınlarının düzgün dəyərləndirilməsini, müxtəlif ünsiyyət növlərinin yaradılması və onların effektiv rolunun dərk olunmasını ehtiva edir. Bu gün Azərbaycan dünya birliyi ölkələri ilə ictimai həyatın bütün sahələrində səmərəli əməkdaşlıq edən bir ölkədir. Buna görə də başqa fəaliyyətlərlə yanaşı, bir və ya iki xarici dildə ünsiyyət qurmağı, əlaqə saxlamağı bacaran şəxsiyyətin formalaşdırılması müasir məktəbin mühüm vəzifələrindən biridir. Buna görə də öyrədilən dil ünsiyyət vasitəsi olmalı və ondan kommunikativ məqsəd üçün istifadə olunmalıdır.

Müasir şagird öz dünyagörüşü və bilikləri həcmində ana dilində və xarici dildə ünsiyyət yaratmağı bacarmalıdır. Xarici dilin kommunikativ səriştəlilik kontekstində həyata keçirilməsində şagirdlərin şifahi şəkildə eşitdiyini və oxuduğunu başa düşmələri, öz fikrini şifahi və yazılı ifadə edə bilmələri, şagird və müəllim arasında danışıq fəaliyyətinin həyata keçirilməsi, şagirdlərin verilən dil və nitq materialları üzərində iş apara bilmələri, dil materiallarının məzmununun necə şərh edilməsi, şəkillər üzrə müsahibə, ekskursiyalar, filmlərin müzakirəsi, bədii əsərlərin təhlili və s. dil vərdişləri əsas rol oynayır. Xarici dillərin tədrisinin əsas məzmunu və məqsədi şagird şəxsiyyətinin inkişaf etdirilməsi ilə yanaşı onların linqvistik qabiliyyətlərinin üzə çıxarılmasına, xarici dildə nitq inkişafına böyük maraq və həvəsin yaradılmasına, şagirdə müstəqil öyrənmək

bacarığı və vərdişlərinin aşılanmasına yönəlməlidir. Xarici dilin öyrənilməsində şifahi nitq fəaliyyətinin əsas bu növlərinə riayət olunmalıdır:

- reseptiv (oxuyub anlama və dinləyib anlama);
- produktiv (öz fikrini şifahi və yazılı ifadə edə bilmə);
- interaktiv (iki və daha çox fərd arasında reseptiv və produktiv fəaliyyətlərin qarşılıqlı mübadiləsi və dəyişməsi);
-mediasiya-əlaqələndirici fəaliyyət (interpretasiya və tərcümələrlə mənimsəmə) (Əliyeva, 2018, s. 194).

Kommunikativ təlim zamanı produktiv fəaliyyət mütləq reseptiv fəaliyyətlə vəhdət təşkil etməlidir. Produktiv fəaliyyət zamanı şagirdlər aşağıdakı hallarda öz fikirlərini yazılı və şifahi ifadə edə bilmək vərdişləri qazanırlar:

-nitqin dialoji və ya monoloji formasından istifadə etməklə;
-gündəlik həyatda rast gəldiyi hər bir hadisəni başa düşüləcək tərzdə şərh etməklə;
- öyrəndiyi səsləri düzgün tələffüz etməyi, cümlənin ritmi, səs tonu və səslənməsi, vurğu kimi danışıq üçün vacib olan elementləri yerli-yerində işlətməklə və s. (Abbasova, 2005, s. 194).

## Nəticə

Nəticə etibarilə, sonda onu da qeyd etmək lazımdır ki, kommunikativ təlim zamanı şagirdlər üçün lazımı sosial-psixoloji atmosferin yaradılması vacibdir. Kommunikativ təlim prosesində şagirdlər yavaş-yavaş müstəqilliyə alışır, sərbəst düşünüb fikir söyləməyə can atırlar. Bu prosesdə müəllim daim şagirdlərin yaş və fərdi xüsusiyyətlərini nəzərə almalı, öyrədilən dildə gözəl danışmağı bacarmalı və bununla şagirdlərə misilsiz nümunə olmalıdır.

## Ədəbiyyat

1. Abbasova, M. Y. (2014). *İngilis dili qlobal dil kimi. XXI əsr mədəni paradiqması multimədəni aspektdə, Respublika elmi-praktik konfransı.* Bakı: Azərbaycan, 128-129.
2. Abbasova, M. Y. (2015). *Müasir dövrdə dil siyasəti problemi.* Azərbaycanda Xarici Dillər: Elmi metodik və ictimai-publisistik jurnal, 79-83.
3. Abbasova, S. (2005). *İngilis dilinin fənninin tədrisi metodikasında yeni, müasir təlim metodları*. Bakı.
4. Abbasova, S. (2010). Xarici dilin tədrisində nitq ünsiyyəti üçün vacib olan psixoloji xüsusiyyətlər. *Mədəniyyətlərarası dialoq: linqvistik, pedaqoji və ədəbi aspektlər*. Bakı: Mütərcim, 191-195.
5. Ağazadə, N. A. (1974). *Xarici dillərin tədrisi metodikası və dilçilik*. Bakı: Nəşriyyat.
6. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. (2013). Təhsil, (10), 4-16.
7. Əliyeva, M. (2018). *Xarici dilin tədrisində kommunikativ yanaşmanın tətbiqi*. Bakı Dövlət Universitetinin Xəbərləri, 2(54), 45–50.
8. Hüseynzadə, G. C. (2009). *Xarici dillərin tədrisində islahatların tətbiqi: Müəllimyönümlü tədrisdən tələbəyönümlü tədrisə keçid*. "Elm" ilinə həsr olunmuş Xarici dillərin tədrisinin aktual problemləri, II Respublika elmi konfransının materialları, Bakı: ADU, 220-226.

Daxil oldu: 17.11.2024
Qəbul edildi: 19.02.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/148-152

**Muğdət Abdullayev**
Bakı, Azərbaycan
https://orcid.org/0009-0002-7773-9658
mugdet.abdul@mail.ru

# Nizami yaradıcılığında atəşpərəstlik simvolikası

## Xülasə

Nizami "Xəmsə"sinin əsas qaynaqlarından biri Zərdüştlük dini və bu dinin müqəddəs kitabı olan Avestadır. Şairin yaradıcılığında atəşpərəstlik fəlsəfəsi ilə yanaşı, simvolik elementləri də öz əksini tapmışdır.

Məqalədə zərdüştlükdə müqəddəslik dəyəri qazanmış od, onun mahiyyəti və əhəmiyyəti haqqında bəhs edilmişdir. Həmçinin bu dinin xaç, xoruz, yumurta və s. kimi rəmzi məna kəsb edən anlayışları izah edilir. Simvolların işlənmə məqamından asılı olaraq onların poetik xüsusiyyətləri də tədqiqata cəlb olunur.

Nizaminin əsərlərindən gətirilən bədii nümunələrdən şairin bu dinin əsasları, fəlsəfi anlayışları haqqında ətraflı məlumata sahib olduğu açıqca görünür. Əsərlərdəki simvollarla qarşılaşarkən Nizaminin onlardan bəzən məcaz yaratmaq üçün də istifadə etdiyinin şahidi oluruq. Bu isə əsərin poetik təsir gücünü daha da artırmış olur.

***Açar sözlər:*** *Nizami, Zərdüştlük, simvol, poetik rəmz, atəşpərəstliyin izləri*

**Mughdat Abdullayev**
Baku, Azerbaijan
https://orcid.org/0009-0002-7773-9658
mugdet.abdul@mail.ru

# The Symbolism of Fire Worship in Nizami`s Creativity

## Abstract

Nizami's Khamsa draws significant inspiration from Zoroastrianism and its sacred text, the Avesta. The poet's works reflect not only the philosophy of fire worship, but also various symbolic elements associated with this ancient belief system.

This article discusses the sanctity, essence and significance of fire in Zoroastrianism. Additionally, it explains other symbolic concepts in this religion, such as the cross, rooster, egg and more. Depending on their contextual usage, these symbols are also examined for their poetic characteristics.

The literary examples taken from Nizami's works clearly indicate that he possessed a deep understanding of the principles and philosophical concepts of Zoroastrianism. When encountering these symbols in his writings, it becomes evident that Nizami sometimes employed them as metaphors. This is enhancing the poetic impact of his works.

***Keywords:*** *Nizami, Zoroastrianism, symbol, poetic symbol, traces of fire worship*

## Giriş

Azərbaycan ədəbiyyatşünaslığında Nizami irsi geniş şəkildə araşdırılmış, onun əsərləri müxtəlif aspektlərdən tədqiqata cəlb olunmuşdur. Nizami yaradıcılığının genişliyi və bədii təfəkkürünün çoxqatlılığı onun illərdir öyrənilməsinə, hələ də filologiya elminin diqqət mərkəzində olmasına zəmin yaradır. Lakin Nizami yaradıcılığına atəşpərəstlik dininin təsirindən çox bəhs edilməmiş, bu məsələ illərlə tədqiqatçıların əsaslı araşdırmalarından uzaq qalmışdır.Xəmsəyə daxil olan hər bir əsəri nəzərdən keçirdikdə Zərdüştlük dini, Avesta ilə əlaqəli müəyyən söz, anlayış, fəlsəfi fikir, problematika ilə qarşılaşmamaq mümkün deyil. Çünki atəşpərəstlik dini Nizami yaradıcılığının

 

ilkin mənbələrindən birini təşkil edir. Ona görə də bu mövzu şairin yaradıcılığında ayrıcı xətt olaraq araşdırılmalıdır.

**Tədqiqat**

Zərdüştilik dinində dörd ünsürdən oda daha çox önəm verilərək hətta müqəddəsləşdirilmişdir. Bunun üçün də zərdüştilərin həyatında od xüsusi yerə sahib olaraq dinin əsasını təşkil edirdi. Zərdüştlüyü Şərq və Qərb alimlərinin bir çoxu atəşpərəstlik dini də adlandırmışdır. Lakin bir qrup tədqiqatçılar zərdüştlüyün atəşpərəstlik dini olması fikrinə qarşı çıxaraq oda müqəddəslik dəyərinin verilməsinin hələ ibtidai icma quruluşundan mövcud olduğunu irəli sürürlər. Gülmira İsmayılova "Zərdüştilikdə dini və ictimai baxışlar" adlı məqaləsində xarici mənbələrə istinadən yazır: "İnsanlar zərdüştiliyin atəşpərəst bir din olduğuna inanırlar. Bu səhv fikirdir. Od Tanrının müqəddəs və ali simvoludur... Od bütün qurban vermə mərasimlərində ilahi simvoldur. Bu müqəddəs obyektdir. Bu ilahi həyatın simvoludur" (İsmayılova, 2010, s. 282). Göründüyü kimi zərdüştiliyin ən önəmli simvolu oddur. Tanrının rəmzi olması etibarilə od ilahi varlığı ifadə edir.

Nizaminin yaradıcılığında da od, atəş təlimi, bu təlimin mahiyyəti, yaradıcısı haqqında da məlumatlar verilmiş, atəşpərəstliyin bu simvolu müxtəlif təşbehlər vasitəsilə təsvir olunmuşdur.

Alovdur nəşənin, keyfin dayağı,
Zərdüştün qırmızı kükürd ocağı...
Odun vətənidir, cəhənnəm, cənnət
Ondan işıq alıb, bundan hərarət.
O bir cəhənnəmdir atəşpərəstə,
Günahsızlar üçün yoldur behiştə.
Zərdüşt "Zəndi" ona nəğmələr saçar,
Muğlar pərvanətək xirqələr açar (Gəncəvi, 2004, s. 120-121).

Nizami odu poetik şəkildə təsvir edərkən onu insanın nəşəsi, Zərdüştün atəşi adlandırır. İkinci beytdə şair odun maddi və mənəvi xassələrinin fəlsəfi şərhini verir. Cənnətin və cəhənnəmin odla bağlılığını vurğulayan şair odun yandırıcılıq xüsusiyyətinin cəhənnəmdən, işığının isə cənnətdən alındığı fikrini irəli sürür. İslam dininə görə bu dinə qulluq etməyənlər axirət dünyasında cəhənnəmə düşərək cəhənnəm atəşində yanacaq. Pis əməlli insanlar üçün od cəhənnəm atəşidir, əməli saleh insanlar üçün isə cənnət Zərdüştün təlimində xeyirli bir yoldur (Əlibəyzadə, 2005).

Sonuncu beytdə Nizami muğların atəşgahlarda odun ətrafında dini nəğmələr oxuyaraq rəqs edərkən ekstaza girmələrini təsvir etmişdir. Zərdüştilər nurun simvolu olan maddi odun qarşısında mənəvi cəhətdən təmizlənmək üçün bu ritualı həyata keçirərkən bəzən vəcdə gəlib xirqələrini yandırardılar. Xirqə atəşpərəstlərin müqəddəs sayılan geyimləridir. Nizami atəşpərəstlərin ekstaz halını digər hissədə də təsvir edir.

Səndəl, ud atəşi ucalır göyə,
Tüstüsü hindlitək durur səcdəyə (Gəncəvi, 2004, s. 120).

Nizami oddan əmələ gələn tüstünü hindli atəşpərəstin səcdəsinə bənzədir. Bu səcdə atəşpərəstlərin asketik ekstaz halıdır. Dalğavari yayılan tüstünün elastik hərəkəti poetik şəkildə atəşpərəstin vəcd anı kimi təqdim olunur. Zərdüştilərin haoma adlanan içkisinin təsiri ilə məst olmaq və nəşələnmə burada atəşin və içkinin yaratdığı halhəmin təsirə bənzədilir (Əlibəyzadə, 2009).

Zərdüştilər odu həmçinin günəşin rəmzi kimi qəbul edərək ona sitayiş edirdilər. Nizami də odun poetik təsviri zamanı oda "Günəşdi, müşkdən örtük bağlamışdı" deyərək onun günəşin simvolu olduğunu vurğulayır.

Oda səcdə edən atəşpərəstlər,
Günəş üçün oda sitayiş eylər (Gəncəvi, 2004, s. 50).

Nizami bu beyt ilə atəşpərəstliyin mahiyyətini açıqlayır. Atəşpərəstlərin oda sitayiş etmələrinin səbəbini sadə dildə şərh edən şair bu dinin Günəş və odla əlaqəli olduğunu, həmçinin Günəş və odun bağlılığını bildirir.

Dua edirik biz,
Günəşə, Ölməz İşığa (Komenski, 2017, s. 72).

Avestada "Günəş himni"ndə isə Günəşə sitayiş belə ifadə olunub. Himndə Günəş şəfəq saçarkən mələklərin dünyanın tərəqqisi və həqiqət üçün Məzdanın yaratdığı yerə xoşbəxtlik və səadət ötürdüyü qeyd olunur. Demək ki, dünyanın bu səadəti Günəşin nuru, işığı sayəsində mövcud olur. Buna görə də, atəşpərəstlər "Sevinclər, işıqlı, ölməz Günəşə" deyərək ona belə dua edirdilər. "Günəş himni"ndə Günəşin nurundan dünyanın tərəqqi tapması, həqiqətin böyüməsi, yer üzünün paklanması və s. təsvir olunur. Günəş yüksəlməyəndə isə bütün bunların əksi olur və dünyaya divlər hökmranlıq edir (Quliyev, 2012).

Nizami yaradıcılığında atəşpərəstlik simvollarından danışdıqda xaç haqqında da xüsusi olaraq bəhs edilməlidir. Şairin irsində bu simvol da öz əksini tapmışdır.

Atəşpərəst önündə xaça dönmək yaraşmaz,
Xətib kimi qılıncla öyünməkdən kar aşmaz (Gəncəvi, 2004, s. 57).

Burada beytdəki fikir qarışıq şəkildə ifadə olunduğu üçün onun mənasını anlamaq və izah etmək çətinlik yaradır. Lakin fikirlərdən anlaşılan odur ki, Nizami atəşpərəst önündə əyilərək qəddini xaça çevirənləri tənqid edir, onların bu əməllərini ikiüzlülük və yaltaqlıq kimi qiymətləndirir. İkinci misrada isə Nizami zor işlətməyin də yaxşı xüsusiyyət olmadığını obrazlı şəkildə bildirir (Şəfizadə, 1996).

Nümunədə işlədilən xaç sözü atəşpərəstliyin simvollarından biridir. Nizami bu sözü həmçinin atəşpərəst sözünün əhatəsində işlədərək bu əlaqəni daha da qüvvətli şəkildə ifadə etmiş olur. Xaçın dini simvol olaraq yaranmasının tarixi çox qədimlərə dayanır. Sonralar bu simvol xristianlıq dininə keçsə də, ilkin olaraq atəşpərəstlikdə mövcud olmuşdur.

Hələ ibtidai icma quruluşu dövründə insanlar kainata can verən, yeri qızdıran günəşi sehrli bir möcüzə olaraq qəbul etdikləri dövrdə xaç rəmzləri zərurətdən meydana gəlmişdir. İbtidai insan soyuq havada, qış fəslində soyuqdan qorunmaq və qida əldə etmək üçün günəşi görmək istəmiş, buna görə də günəşin obrazını qaya, daş üstündə həkk etmişdir. Onlar bununla günəşin gəlməsini tezləşdirmək istəmişlər.

Qədim əsatirlərdə də xaçların yaranması insanların günəşə, sonralar isə oda sitayiş etməsilə əlaqələndirilir. Günəşin obrazını ağac üzərində bağlayıb göylərə qaldıraraq kainata qovuşdurmaq ideyası xaçların yaranmasına səbəb olmuşdur. Beləliklə xaç atəşpərəstlik dininin simvolu olaraq günəş dövranını ifadə etmişdir.

"Xosrov və Şirin" poemasının sonunda, "Paxılları məzəmmət" hissəsində Nizami əsərindən danışarkən xaç simvolunu yenə də xatırladır:

Bir gövhər atmışam dənizə, uzaq
Qoymuşam xaç üstə bir yanar çıraq.
Sən o dürrü qaldır, dəryanı tərk et,
Xaçı yalqız burax, çırağı al, get!
Çox da odpərəstlik bunda əyandır,
Bu sözlər mütləqa yoğrulmuş qandır (Gəncəvi, 2004, s. 359).

Şair burada yanar çıraq deyərkən əsərini, yəni "Xosrov və Şirin" poemasını nəzərdə tutur. Ağılın nur, işıq olduğu Nizaminin yaradıcılıq fəlsəfəsində mühüm yer tutur və şair bunu dəfələrlə qeyd etmişdir. Bu nümunədə də Nizami əsərini ağlının məhsulu olaraq çıraq adlandırır. "Xaçı burax, çırağı al get" deməklə şair əsərin mövzusundan asılı olmayaraq onun poetik gözəlliklərinin,

məzmununun dolğunluğunun mövcudluğundan bəhs etmiş olur. Nizami obrazlı şəkildə deyir ki, əsərdəki atəşpərəstliyi burax, sən onun məzmununa diqqət yetir, qoy bu əsər çıraq kimi əqlini işıqlandırsın. Beləliklə, Nizami xaçı burada atəşpərəstliyin simvolu kimi təqdim etməklə həmçinin ümumiləşdirmə aparmışdır.

Nizami əsərlərində atəşpərəstlik dininə aid olan daha bir simvolla qarşılaşırıq ki, bu da xoruzdur. Xoruz atəşpərəstlikdə müqəddəs hesab edilmiş, tanrının bir simvolu olaraq rəmzi məna daşımışdır. Xoruz banlayaraq səhərin açılmasından xəbər verir, yəni insanları işığa səsləyir. Bunun üçün atəşpərəstlər xoruzu işığın carçısı kimi qəbul edərək onu kultlaşdırmışlar.

Azərbaycan folklorunu araşdıran Y.V.Çəmənzəminli “Xalq ədəbiyyatının təhlili” adlanan məqaləsində folklorumuzda zərdüştilik təsirlərindən bəhs edərək yazır: “Zərdüştilərdə “pəridar” adlanan xoruz müqəddəs kimi tələqqi olunur, çünki işığın və gündüzün zühurunu xalqa xəbər verir. Xoruz işıq allahı Hörmüzdün güruhundan sayılır” (Çəmənzəminli, 2005, s. 292).

“Avesta”nın Vəndidat hissəsində xoruz yüksək poetik lövhələrlə təsvir olunur, sübhü qarşılayaraq səsini ucaldır və bununla da insanları yuxudan oyadır, onları öz işlərilə məşğul olmağa çağırır. Nizaminin yaradıcılığında da atəşpərəstlikdən gələn bu ənənə davam etdirilmişdir.

Deyirlər gecə div yol kəsən zaman,
Xoruzlar qışqırır “Ay Allah, aman!”
Bu necə gecəydi, yüz divi vardı,
Xoruzlar səsini çıxarmırlardı? (Gəncəvi, 2004, s. 234).

Zərdüştilər kainatı işıqla qaranlığın mübarizəsi kimi dərk edirdilər. Bu dualistik fikirlər atəşpərəstlik fəlsəfi görüşlərində həyatdakı hər bir şeyə tətbiq edilirdi. Gündüz işıqlı olduğu üçün nuru, gecə qaranlıq olduğuna görə isə zülməti ifadə edirdi. Atəşpərəstlik görüşlərinə görə gecə qaranlıq olduğu üçün bu zaman divlər dünyaya hökmranlıq edir. Nümunədə də Nizami buna işarə edərək divlərin gecəyə hakim kəsilmələrini, xoruzun banlamasını isə divlərdən qurtuluşa çağırış olduğunu poetik şəkildə ifadə etmişdir.

Xoruzun başında görüb odlu tac,
Bəzən kəklik yanır, bəzən də turac (Gəncəvi, 2004, s. 101).

Nümunə verdiyimiz beytdə Nizami orijinal bir bənzətmə yaratmışdır. O, xoruzun başındakı pipiyi odlu tac kimi oxucuya təqdim edir. Xoruzun başındakı pipiyin tac quruluşunda olması zahirən doğrudur. Lakin burda “odlu tac” ifadəsini sadəcə pipiyin taca bənzədilməsi kimi qəbul etmək doğru olmaz. Odlu sözünü nəzərdən keçirək. Odun rənginin qırmızı olması məlumdur. Xoruzun da başındakı pipiyin rəngi qırmızıdır. Tac dedikdə də burda şair alovu nəzərdə tutur. Odlu tac da elə məhz alovun dilidir. Bu bənzətməni mükəmməl hesab etmək olar. Nizami atəşpərəstlik anlayışlarını həm məzmun, həm də forma məsələlərinə tətbiq etmişdir. Nizaminin təsvirinə görə xoruz özündə atəşpərəstliyin sitayiş obyekti olan odu da ehtiva etməkdədir.

Nizami Ramazan bayramı zamanı yumurtanın boyanaraq onunla taleh oxuma adətinin də zərdüştilik dinindən gəldiyini göstərmişdir.

Dövran gümüş teştin ağzını açdı,
Qara qarğa qızıl yumurta saçdı,
Qoca möbidlərsə tarix boyunca,
Yumurta və teştdən demiş doyunca (Gəncəvi, 2004, s. 194).

Böyük verilənlər indi Data Mining vasitəsilə emal olunur. Data Mining özündə müxtəlif elm sahələrini və texnologiyaları birləşdirir. BV ilə işdəki çətinliklərin texnoloji həlli ilə IBM, Oracle, Microsoft, HP, Teradata, EMC, SAS, SAP və s. kimi şirkətlər məşğuldurlar. Çox sayda informasiya sistemlərinin yaradıcısı olan Google şirkəti isə 2004-cü ildə MapReduce hesablama modelini təqdim etmişdir (Laney, 2001; Lohr, 2013).

Əsas məsələ bu verilənləri necə analiz etmək və analizin nəticələrinə görə doğru qərarı necə qəbul etmək sualına cavab verməkdir. Bir çox təcrübəli mütəxəssislər (Mixail Leviyev, AlqoMost təşkilatının rəhbəri) apardıqları tədqiqatların nəticələrinə əsaslanaraq əmindirlər ki, verilənlərin analizi müəllimlərin işlərində effektivliyin yüksəldilməsinə, təhsilin fərdiləşdirilməsinin təşkilinə və tələbələrdə məhz seçdikləri ixtisaslara uyğun vərdişlərin aşılanmasına kömək edir.

Hərbi təhsil müəssisəsi (universitet) hər gün çoxsaylı hadisələrin və tədbirlərin baş verdiyi, çox böyük həcmdə verilənləri (böyük verilənlər) generasiya edən bir cəmiyyətdir. Bu verilənlərə təhsilalanlar haqqında şəxsi məlumatlar, onların dərslərdə aldığı qiymətlər, dərsə davamiyyətlərinin göstəriciləri, mədəni-kütləvi tədbirlərdə, idman yarışlarında, konfranslarda iştiraklarını xarakterizə edən və s. məlumatlar aiddir (Valehov, Osmanov, 2021).

Yuxarıda qeyd olunanları, yalnız hərbi tədris müəssisələrində tədris prosesi ilə xidmətin paralel baş verdiyini nəzərə alıb hər bir təhsilalanın fərdi modelini yaratmaq daha məqsədəuyğundur. Kursantın fərdi modelində onun dərslərdə aldığı qiymətlər, ictimai, mədəni-kütləvi tədbirlərdə iştirakı barədə məlumatlar, ona dərs deyən müəllimlərin və komandirlərinin verdiyi rəylər və s. öz əksini tapmalıdır. Məlumatlar bazasının fərdi modelləri özündə saxlaması ixtisaslar üzrə təyinatlar və kadr seçimi məsələlərində doğru qərarların qəbul edilməsi üçün əhəmiyyətli rol oynaya bilər (Wired, 2014).

Ali təhsil müəssisəsinin modelini qurduqdan sonra onun fəaliyyətini xarakterizə edən böyük verilənləri (BV) Big Data texnologiyaları və İntellektual İnformasiya Sistemi vasitəsilə analiz etməklə hansı nəticələri əldə etmək nəzərdə tutulur:

- təhsilalanların müvəffəqiyyət göstəricilərinin statistik və intellektual analizi nəticələrin nə qədər obyektiv olduğunu, kəsilənlərin qeyri-müvəffəq qiymət almalarının əsl səbəblərini (təsadüfi, mənəvi-psixoloji durumda baş verən qəfil dəyişiklikdən asılı olduğunu və s.) müəyyən etmək;
- əgər digər səbəblər yoxdursa geri qalanlar üçün individual tədris proqramları tərtib etmək;
- dərs dedikləri qruplarda mütəmadi olaraq aşağı nəticələr göstərən müəllimlərin metodikalarının təkmilləşdirilməsi haqda tədbirlər planı hazırlamaq;
- mütəxəssis hazırlığı proqramının rəqabətədavamlı və gələcək dövrlərdə də müvəffəqiyyətli olmasını proqnozlaşdıran metodik tövsiyələrin hazırlanması.

## Nəticə

1. Müasir ali təhsil müəssisələrinin Böyük Verilənlərin generasiya olunduğu mənbələrdən biri olduğu, tədrisin və bütövlükdə ali təhsil müəssisələrinin idarə olunmasında Big Data texnologiyalarının tətbiqi mümkündür.
2. Tədris-məlumat bazasının yaradılması üçün verilənlərin daxil olunması variantları təklif edilmişdir.
3. Gələcəkdə ali təhsil müəssisəsinin modelini qurduqdan sonra onun fəaliyyətini xarakterizə edən böyük verilənləri (BV) Big Data texnologiyaları və İntellektual İnformasiya Sistemi vasitəsilə analiz etməklə əldə oluna biləcək nəticələr verilmişdir.

## Ədəbiyyat

1. Big Data, Big Impact: New possibilities for international development. (2012). *World Economic Forum.* www.weforum.org
2. Big data: The next frontier for innovation, competition, and productivity. (2011, May). *McKinsey Global Institute.* http://www.mckinsey.com/
3. Clifford, L. (2008). Big data: How do your data grow? *Nature*, 455, 28-29.
4. Dean, J., Ghemawat, S. (2004). MapReduce: Simplified data processing on large clusters. In

*Proceedings of the Sixth Symposium on Operating System Design and Implementation* (OSDI ’04), Vol. 6, 137-150. Berkeley, CA, USA.
5. Diebold, F. X. (2012). On the origin(s) and development of the term "Big Data". *PIER Working Paper Archive, Penn Institute for Economic Research*, Department of Economics, University of Pennsylvania.
6. Ghemawat, S., Gobioff, H., Leung, S. T. (2003, October). The Google File System. In *Proceedings of the Nineteenth ACM Symposium on Operating Systems Principles* (SOSP ’03), 29-43. New York, USA.
http://www.forbes.com/sites/perryrotella/2012/04/02/
7. Is data the new oil? (2012, April 2). *Forbes.*
8. Junqué de Fortuny, E., Martens, D., Provost, F. (2013). Predictive modelling with Big Data: Is bigger really better? *Big Data*, 1(4), 215-226.
9. Laney, D. (2001, February). 3D Data management: Controlling data volume, velocity and variety. *META Group*, Inc. (now Gartner, Inc.). http://blogs.gartner.com/
10. Lohr, S. (2013). The origins of "Big Data": An etymological detective story. *The New York Times.* http://bits.blogs.nytimes.com/2013/
11. Məmmədova, M. H., Cəbrayılova, Z. Q. (2016). İnsan resurslarının idarə olunması məsələlərinin həllində böyük verilənlərin istifadəsi imkanları və problemləri. *İnformasiya Texnologiyaları Problemləri*, (№), 39-48.
12. Valehov, S. A., Osmanov, S. F. (2021). Xüsusi təyinatlı müəssisələrində tədrisin idarə olunmasında Big Data texnologiyalarından istifadə imkanları. *Respublika Elmi-Praktiki Konfransın Materialları.* Bakı.
13. Wired. (2014, July). Data is the new oil of the digital economy. http://www.wired.com/2014/07/

Daxil oldu: 29.11.2024
Qəbul edildi: 04.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/245-249

**Rahima Sadigova**
Nakhchivan State University
https://orcid.org/0009-0008-8764-0276
rehimesadiqova41@gmail.com

# The Role of Bernoulli's Formula in Economics

## Abstract

The Bernoulli's formula is used in economics and finance to manage risk, develop investment strategies, and improve decision-making processes. Within the framework of the expected benefit theory, investors seek to maximize not only income, but also utility.

In the financial sector, banks and investors use the Bernoulli's formula in risk assessment, insurance, and portfolio management. In the transport and infrastructure sectors, it is applied to increase efficiency.

This principle plays a key role in game theory and in formulating optimal strategies in competitive markets. In general, the Bernoulli's formula helps to make rational economic decisions and effectively manage risks.

***Keywords:*** *Bernoulli's formula, risk management, expected benefit theory, decision-making process, ınvestment strategies, financial markets, game theory, macroeconomics*

**Rəhimə Sadıqova**
Naxçıvan Dövlət Universiteti
https://orcid.org/0009-0008-8764-0276
rehimesadiqova41@gmail.com

# Bernulli düsturunun iqtisadiyyatda rolu

## Xülasə

Bernoulli düsturu iqtisadiyyat və maliyyədə riskin idarə olunması, investisiya strategiyalarının qurulması və qərarvermə proseslərinin təkmilləşdirilməsində istifadə olunur. Gözlənilən fayda nəzəriyyəsi çərçivəsində investorlar yalnız gəliri deyil, eyni zamanda faydanı maksimallaşdırmağa çalışırlar.

Maliyyə sektorunda banklar və investorlar risk dəyərləndirməsində, sığorta və portfel idarəetməsində Bernoulli prinsipindən yararlanırlar. Nəqliyyat və infrastruktur sahələrində isə səmərəliliyi artırmaq üçün tətbiq edilir.

Oyun nəzəriyyəsində və rəqabətli bazarlarda optimal strategiyaların formalaşdırılmasında bu düstur əsas rol oynayır. Ümumilikdə, Bernoulli düsturu iqtisadi qərarların rasional qəbul edilməsinə və risklərin effektiv idarə olunmasına kömək edir.

***Açar sözlər:*** *Bernoulli düsturu, riskin idarə edilməsi, gözlənilən fayda nəzəriyyəsi, qərarvermə prosesi, investisiya strategiyaları, maliyyə bazarları, oyun nəzəriyyəsi, makroiqtisadiyyat*

## Introduction

Decision-making processes in the fields of economics and finance are often carried out under conditions of uncertainty. Various mathematical models are used to assess and manage these uncertainties. One such model is the Bernoulli formula. Although the Bernoulli principle is used to explain the flow of liquids and gases in the fields of physics and engineering, it is also widely applied in economics and finance. This formula helps in the formation of economic decisions, risk management and determination of optimal investment strategies (Bernoulli, 1738).

**Research**

This article will examine in detail the use of the Bernoulli formula in economics, its impact on decision-making theory and practical applications (Gibbons, 1992).

**Economic Basis of Bernoulli's Formula**

Bernoulli's principle is commonly applied in fluid mechanics and describes the energy of liquids or gases. The formula is expressed as (Von Neumann, & Morgenstern, 1944):

$$P + \frac{1}{2}\rho v^2 + \rho g h = const$$

Here:

- $P$ - pressure,
- $\rho$- density,
- $v$- speed,
- $g$- gravity,
- $h$- is the height.

This formula is applied in various forms in economics and finance. In particular, in the field of risk and expected return theory, the Bernoulli principle plays a key role in decision-making models.

**Bernoulli's Principle and Expected Utility Theory**

Bernoulli's Principle, widely known for its applications in fluid dynamics, also has significant implications in economics through Expected Utility Theory (EUT). Proposed by Daniel Bernoulli in the 18th century, this theory explains how individuals make decisions under uncertainty, particularly when faced with risk (Savage, 1954).

**Expected Utility Theory: The Foundation of Decision-Making**

Traditional economic models assumed that individuals made decisions to maximize expected monetary value. However, Bernoulli argued that people instead maximize their expected utility, not just their financial gains. His key insights include (Arrow, 1971):

- **Diminishing Marginal Utility of Wealth**: The additional satisfaction (utility) gained from extra wealth decreases as a person becomes wealthier.
- **Risk Aversion**: Since people prefer a certain outcome over a gamble with the same expected value, they exhibit risk-averse behavior.
- **Subjective Decision-Making**: Different individuals value the same monetary gains differently, influencing their choices in uncertain situations.

**Applications of Expected Utility Theory**

**1. Investment Decisions**

Investors weigh potential returns against associated risks rather than just choosing the highest expected return (Fudenberg, & Tirole, 1991).

Portfolio diversification follows from EUT, as individuals prefer to spread risk across different assets (Osborne, & Rubinstein, 1994).

**2. Insurance Markets**

People buy insurance despite the expected monetary loss because the certainty of avoiding catastrophic loss provides higher utility than taking the risk.

**3. Gambling and Behavioral Economics**

Risk-averse individuals reject fair gambles, while risk-seeking individuals (like lottery players) accept them due to differences in their utility perception.

**4. Game Theory and Strategic Decisions**

Firms and individuals assess risks and rewards in competitive settings using EUT to predict rational behaviors in markets, auctions, and negotiations (Mas-Colell, Whinston, & Green, 1995).

**Financial and Economic Applications of Bernoulli's Formula**

**1. Risk and Decision Making**

Economic agents must take future uncertainties into account when making decisions. Bernoulli theory provides fundamental insights in this area. For example (Camerer, 2003):

- If an investor invests in a high-risk fund, it will depend on his subjective risk attitude.

- Banks can use the Bernoulli formula to assess credit risk.

**2. The Impact of Aerodynamics on the Economy**

Bernoulli's principle plays an important role in the transportation and aviation industries. Fast and efficient air transport drives economic development, reduces logistics costs, and speeds up trade relations (Myerson, 1997).

**3. Macroeconomics and Infrastructure Investments**

Applications of Bernoulli's principle to energy and flow theory also play an important role in the infrastructure sector of the economy. Water pipelines, hydropower, aerodynamics, and transportation systems are optimized based on this principle, which increases economic efficiency (Rothschild, & Stiglitz, 1976).

**Bernoulli's Principle and Game Theory**

Bernoulli's Principle is primarily known for its applications in fluid dynamics, but its influence extends beyond physics into economics and decision sciences. One of its most significant contributions is in the realm of Game Theory, particularly in understanding how individuals make decisions under uncertainty. This connection is largely due to Daniel Bernoulli's Expected Utility Theory, which laid the foundation for modern economic and strategic decision-making models (Varian, 2010).

**Bernoulli's Principle in Decision-Making and Risk Analysis**

Bernoulli's Principle, initially formulated in the field of fluid dynamics, has profound implications in decision-making and risk analysis, particularly through Expected Utility Theory (EUT). Daniel Bernoulli's insights help explain how individuals and organizations assess risk and make rational choices under uncertainty (Kahneman, & Tversky, 1979).

**Decision-Making Under Uncertainty**

In economic and financial contexts, decision-making often involves evaluating uncertain outcomes. Classical decision theory assumes individuals maximize expected monetary value, but Bernoulli demonstrated that people maximize expected utility instead (McAfee, & McMillan, 1987).

- **Risk Aversion**: Most individuals prefer a guaranteed outcome over a risky alternative with the same expected value.
- **Diminishing Marginal Utility**: The additional satisfaction from gaining more wealth decreases as wealth increases.
- **Subjective Valuation:** People assign different utilities to monetary gains and losses, influencing their risk preferences.

**Applications in Risk Analysis**

**1. Investment Strategies and Financial Markets**

- Investors use risk-adjusted returns rather than absolute profits to guide portfolio allocation.
- Portfolio diversification is based on Bernoulli's principle—spreading risk across multiple assets enhances overall expected utility.
- The Sharpe ratio and other risk-return measures derive from this concept.

**2. Insurance and Risk Management**

- **Why people buy insurance**: Even if the expected monetary loss from insurance premiums is negative, the security of avoiding catastrophic loss provides higher utility than taking the risk.
- Companies use expected utility models to price insurance policies based on potential losses and customer risk aversion.

**3. Corporate Decision-Making**

- Firms assess risks in market expansion, product launches, and mergers using expected utility rather than just expected profits.
- **Game Theory and Strategic Planning**: Companies model competitors' actions and market uncertainties through Bernoulli-inspired decision models.

**4. Gambling and Behavioral Economics**

- Bernoulli's principle explains why many people **reject fair bets** (risk aversion) but still play lotteries (risk-seeking behavior in low-probability, high-reward situations).

- **Prospect Theory**, developed by Kahneman and Tversky, expands on this by showing how losses hurt more than equivalent gains satisfy.

**Applications of Bernoulli's Principle in Game Theory**

**1. Risk Assessment in Strategic Games**

- In competitive and cooperative game settings, players evaluate their choices based on perceived utility rather than just financial gains.
- Companies in oligopolistic markets, for example, may choose strategies that minimize losses rather than maximize short-term profits, as seen in pricing wars and market entry decisions.

**2. Nash Equilibrium and Expected Utility**

- In mixed-strategy Nash equilibrium, where players must choose probabilistic strategies, Bernoulli's principle helps explain how they assess different potential outcomes based on their utility.
- Consider a business deciding whether to enter a new market. The firm evaluates not just the expected profit but the risk-adjusted return, factoring in uncertainty and competition.

**3. Gambling, Betting, and Economic Behavior**

- In gambling and financial markets, Bernoulli's principle explains why risk-averse individuals may decline fair bets—even if the expected monetary value is positive—due to diminishing marginal utility.
- This principle is also applied in insurance markets, where individuals prefer to pay a premium to mitigate large potential losses, even when the expected value suggests otherwise.

**4. Auction Theory and Bidding Strategies**

- Bernoulli's Expected Utility Theory plays a vital role in auction strategies, particularly in first-price and second-price auctions.
- Risk-averse bidders tend to bid higher than the expected value to increase their probability of winning, while risk-neutral players bid closer to their actual valuation.

## Conclusion

Bernoulli's principle plays an important role in economics and finance. In particular, it is widely applied in the fields of expected utility theory, risk management, financial markets, and game theory. The principle is used to explain the decision-making processes of investors, to determine the pricing strategies of insurance companies, and to help optimize economic systems (Tadelis, 2013).

The application of Bernoulli's principle in economics is broad and can be further developed for future research. The principle remains a powerful tool for making optimal economic decisions under uncertainty (Markowitz, 1952).

Bernoulli's principle provides a foundation for understanding strategic decision-making in game theory through the theory of expected utility. By incorporating risk preferences and reducing marginal utility, it explains why individuals and firms make choices that deviate from maximizing net profit. Applications in competitive markets, financial decision-making, auctions, and negotiations demonstrate the broad influence of Bernoulli's ideas in game theory (Pratt, 1964).

## References

1. Bernoulli, D. (1738). *Exposition of a New Theory on the Measurement of Risk.* Translated in *Econometrica*, 22(1), 23-36.
2. Von Neumann, J., & Morgenstern, O. (1944). *Theory of Games and Economic Behavior.* Princeton University Press.
3. Savage, L. J. (1954). *The Foundations of Statistics.* John Wiley & Sons.
4. Arrow, K. J. (1971). *Essays in the Theory of Risk-Bearing.* North-Holland Publishing.
5. Fudenberg, D., & Tirole, J. (1991). *Game Theory.* MIT Press.
6. Mas-Colell, A., Whinston, M. D., & Green, J. R. (1995). *Microeconomic Theory.* Oxford University Press.

7. Myerson, R. B. (1997). *Game Theory: Analysis of Conflict.* Harvard University Press.
8. Camerer, C. F. (2003). *Behavioral Game Theory: Experiments in Strategic Interaction.* Princeton University Press.
9. Rothschild, M., & Stiglitz, J. (1976). *Equilibrium in Competitive Insurance Markets: An Essay on the Economics of Imperfect Information. The Quarterly Journal of Economics*, 90(4), 629-649.
10. Kahneman, D., & Tversky, A. (1979). *Prospect Theory: An Analysis of Decision under Risk. Econometrica*, 47(2), 263-292.
11. McAfee, R. P., & McMillan, J. (1987). *Auctions and Bidding. Journal of Economic Literature*, 25(2), 699-738.
12. Gibbons, R. (1992). *A Primer in Game Theory.* Harvester Wheatsheaf.
13. Osborne, M. J., & Rubinstein, A. (1994). *A Course in Game Theory.* MIT Press.
14. Varian, H. R. (2010). *Intermediate Microeconomics: A Modern Approach.* W. W. Norton & Company.
15. Tadelis, S. (2013). *Game Theory: An Introduction.* Princeton University Press.
16. Markowitz, H. (1952). "Portfolio Selection." The Journal of Finance, 7(1), 77-91.
17. Pratt, J. W. (1964). "Risk Aversion in the Small and in the Large." Econometrica, 32(1/2), 122-136.

Received: 24.01.2025
Accepted: 02.03.2025

**TEXNİKA ELMLƏRİ**
**TECHNICAL SCIENCES**

DOI: https://doi.org/10.36719/2663-4619/114/250-255

**Cahan Əhmədova**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
texnika üzrə fəlsəfə doktoru
https://orcid.org/0000-0003-4113-9351
ahmedova_cahan1975@mail.ru
**Aydın Əhmədov**
Azərbaycan Dövlət Neft və Sənaye Universiteti
magistrant
https://orcid.org/0009-0004-4710-5413
akhmedoff.aydin@mail.ru

# Dəniz suyunun termiki distillə texnologiyasında yanma məhsullarının tullantı istiliyindən istifadə etməklə ekoloji zərərin azaldılması

**Xülasə**

Təqdim olunan məqalədə elektrik stansiyalarının ikinci enerji ehtiyatları hesabına Xəzər dənizi suyunun termiki şirinləşdirilməsi prosesinin hesablama modeli verilmişdir. Termiki şirinləşdirmə ani qaynama buxarlandırıcılarına əsaslanır. Əsas məqsəd tullantı istilikdən istifadə etməklə şirinləşdirmə texnologiyasının xərclərini və atmosferdə istixana effekti yaradan qazların emissiyasını azaltmaqdır. Burada Səngəçal dizel elektrik stansiyasının modullarının tullantı istiliyindən istifadə etmək nəzərdə tutulmuşdur. Termiki distillə prosesinin müxtəlif növləri təhlil olunmuşdur. Çoxpilləli resirkulyasiya növlü buxarlandırıcıların səmərəli olduğu aşkar edilmişdir. Hesablama-analitik tədqiqatlar çoxpilləli ani qaynama qurğusu üçün aparılmış və hesablama modeli qurulmuşdur.

***Açar sözlər:*** *Xəzər dənizi suyu, ikinci enerji ehtiyatları, ekoloji zərər, termiki distillə, çoxpilləli ani qaynama, şirinləşdirmə, hesablama modeli*

**Jahan Ahmadova**
Azerbaijan State Oil and Industry University
PhD in Engineering
https://orcid.org/0000-0003-4113-9351
ahmedova_cahan1975@mail.ru
**Aydin Ahmadov**
Azerbaijan State Oil and Industry University
Master student
https://orcid.org/0009-0004-4710-5413
akhmedoff.aydin@mail.ru

# Reduction of Ecological Damage by Using Waste Heat of Combustion Products in Thermal Distillation Technology of Seawater

**Abstract**

The presented article is given a computational model of the process of thermal desalination of Caspian Sea water using secondary energy reserves of power plants. Thermal desalination is based on flash evaporators. The main goal is to reduce the costs of desalination technology and emissions of greenhouse gases into the atmosphere by using waste heat. Here, it is planned to use the waste

 

heat of the modules of the Sangachal diesel power plant. Various types of thermal distillation processes were analyzed. Multi-stage recirculation evaporators were found to be efficient. Computational-analytical studies were conducted for a multi-stage flash evaporator and a computational model was built.

***Keywords:*** *Caspian Sea water, secondary energy resources, environmental damage, thermal distillation, multistage flash boiling, sweetening, computational model*

## Giriş

Məlumdur ki, BMT-nin iqlim dəyişikliyi konfransları hər il keçirilir. Bu konfransların məqsədi iqlim sisteminə təhlükəli hesab olunan müdaxilələrin qarşısının alınması, daha dəqiq istixana qazlarının emissiyalarının azaldılması yollarının araşdırılmasıdır. Konfransın məsələlər siyahısına içməli (şirin) su qıtlığı probleminin həlli də daxil edilmişdir. Tərəflər konfransının 2024-cü il noyabr ayında keçirilən 29-cu sessiyasına – COP 29-a Azərbaycan Respublikası ev sahibliyi etmişdir. COP 29-un Bakı şəhərində keçirilməsinə həm də Azərbaycanın yaşıl enerji siyasətinə qlobal dəstəyi səbəb olmuşdur. Bununla yanaşı ölkə Prezidenti İlham Əliyev 2024-cü ili "yaşıl dünya naminə həmrəylik ili" elan etmişdir.

Bütün bu qeyd olunanlar əsas götürülərək aparılan tədqiqatlar ətraf mühitə vurulan zərəri azaltmaq, yəni istixana effektinə təsir edən qazların emissiyasını azaltmaq məqsədi ilə dəniz suyunun yüksək temperaturlu termiki distillə prosesinin İES-in yanma məhsullarının istiliyi hesabına aparılmasına həsr olunmuşdur.

**Tədqiqat**

BMT-nin verdiyi məlumatlara görə (Abdullayev, 2010) dünyada 780 mln. insanın təmiz içməli su mənbələrinə çıxışı yoxdur, 1.7 mlrd insan içməli su qıtlığından əziyyət çəkir. Planetimizin 70%-i su ilə örtülsə belə, onun ancaq 3 %-i şirin sudur və bunun da 2/3-ni buzlaqlar təşkil edir.

**Su qıtlığının səbəbləri:**

1. Urbanizasiya və sənayeləşmə – sənayedə texniki məqsədlər üçün içməli sudan istifadə; içməli su hövzələrinə sənaye tullantı sularının axıdılması; onların tərkibindəki mikrob və pestisidlərlə su hövzələrinin çirklənməsi və yararsız hala gəlməsi və s.
2. Kənd təsərrüfatının inkişafı – dünyada mövcud olan şirin suyun 70%-i kənd təsərrüfatında istifadə olunur; bu sahədə sudan israfçılıqla istifadə etmək çayların, göllərin, hətta yeraltı su hövzələrinin qurumasına gətirir.
3. Ölkələrin əhalisinin sayının çox hissəsinin əsasən böyük şəhərlərdə yaşaması səbəbindən su qıtlığı problemi burada daha qabarıqdır.

XXI əsr içməli (şirin) su qıtlığı probleminin dünya miqyasında daha da kəskinləşməsini xarakterizə edir. Növbəti illərdə içməli su qıtlığından əziyyət çəkən insanların sayının 2 milyarda çatması proqnozlaşdırılır (Abdullayev, Əhmədova, Ağamalıyev, 2010). Bu problemin həlli kimi dünya mütəxəssisləri duzlu (dəniz və okean) suların şirinləşdirilməsini təklif edir və bir sıra dünya ölkələrində (Qazaxıstan, Səudiyyə Ərəbistanı, Qətər, İsrail və s.) uğurla tətbiq olunur. Hal-hazırda dünyada ~15 min şirinləşdirici qurğu sutkada $>6\cdot10^{10}$ litr içməli su hasil edir (El-Dessouky, Ettouney, 2002). Burada əsasən əks-osmos şirinləşdirmə qurğularından istifadə olunur.

Azərbaycan Respublikası üçün su qıtlığı aktualdır, əsasən də Abşeron regionunda. Qeyd olunanları nəzərə alaraq aparılan tədqiqatlar sənaye müəssisələri üçün, əsasən İES-lərin əlavə suyunu hazırlamaq məqsədilə Xəzər dənizinin suyunun şirinləşdirilməsinə həsr olunmuşdur. Xəzər dənizi suyunun ilkin və Na-kationlaşdırma süzgəcində yumşaldıqdan sonra ion tərkibi, mq-ekv/dm³: xam suyun – $Na^+$=136, $Ca^{2+}$=16, $Mg^{2+}$=60, $Cl^-$=140, $SO_4^{2-}$=68, $HCO_3^-$=4; TDS=12646 mq/dm³; yumşaldılmış su – uyğun olaraq 212, 0.01, 0.01, 140, 68, 4, TDS=13350 mq/dm³.

Məlum olduğu kimi bir sıra su şirinləşdirici üsul mövcuddur (Feyziyev, 2009): əks-osmos; termiki distillə; kimyəvi; ion mübadiləli; dondurulma; elektrodializ; nanosüzülmə; düz osmos və s.

Hər üsulun özünəməxsus müsbət və mənfi cəhətləri vardır. İstifadə faizinə görə baromembran texnologiyasından əks-osmos (~65%) birinci yeri tutur. Amma onun permeatı İES-lərin orta, yüksək və s. qazanlarının əlavə suyu qismində istifadə oluna bilməz. Əks-osmosla şirinləşdirilən dəniz suyunun ümumi duzluluğu 12646 mq/dm³-dan 100÷200 mq/dm³-a düşür.

Dünyada istifadə sahəsinə görə ikinci yerdə olan dəniz suyunun şirinləşdirilmə texnologiyası termiki distillədir. Termiki distillə üsulunun üstün cəhətləri: məhsuldarlığın yüksək olması

(irimiqyaslı şirin su istehsalında istifadəsi səmərəlidir); şirinləşdirilən suyun qalıq konsentrasiyasının çox aşağı olması (düz axınlı qazanların əlavə suyu göstəricisində); yüksək duzluluqlara malik suların şirinləşdirilə bilmə imkanı.

Sənaye miqyasında üç növ termiki şirinləşdirilmə üsulu tətbiq olunur:

- Çoxpilləli səthli qaynama (Multiple-Effect Distillation-MED);
- Çoxpilləli ani qaynama (Multi-Stage Flash Distillation-MSF);
- Çoxpilləli buxar kompressiyalı (Vapor-CompressionVC).

Məlum olduğu kimi, qeyd olunan şirinləşdirmə texnologiyalarının ən böyük mənfi cəhəti istilik xərclərinin yüksək olmasıdır (~40÷50%). Bunu nəzərə alaraq aparılan tədqiqatların məqsədi İES-lərin yanma məhsullarının tullantı istiliyi hesabına dəniz suyunun ani qaynama termiki şirinləşdirmə texnologiyasının tədqiqidir. Belə texnologiyanın araşdırılmasında digər məqsəd tüstü qazlarının ətraf mühitə vurduğu zərəri azaltmaqdır.

Məqalədə, təcrübədə geniş tətbiq sahəsinə malik olan (Report.az, 2025) çoxpilləli ani qaynama üsulunun stansiyaların ikinci enerji ehtiyatları hesabına işləməsinin hesablama modeli təklif olunur.

Bununla yanaşı, İES-lərin kifayət qədər ikinci enerji ehtiyatlarının mövcudluğu haqqında məlumatlar vardır. Misal kimi Abşeronda istismar olunan Səngəçal elektrik stansiyasını göstərmək olar. Bu stansiyada gücü 16 MVt olan 18 modul işləyir. Modullardan ətraf mühitə temperaturu 400÷500°C olan yanma məhsulları atılır ki, bunlardan 6 modulun tullantı istiliyi stansiyanın xüsusi ehtiyaclarına sərf edilir. Qalan 12 modulun ikinci enerji ehtiyatları atmosferə atılaraq ətraf mühitin istiliklə çirklənməsinə və istixana qazlarının emissiyasına səbəb olur.

Aparılan araşdırmalara görə (Satbayev University) hər moduldan utilizə olunan istilik miqdarı ~15 MVt təşkil edə bilər. Termiki distilləyə istiliyin xüsusi sərfi isə 200÷500 MC/m³ təşkil edir (Slesarenko, 1999). Beləliklə, stansiyanın hər modulundan atılan istilik hesabına nəzəri olaraq 1,4÷5,2 min ton/sut şirinləşdirilmiş suyun əldə olunması mümkündür.

**2. MSF distillə texnologiyasının texnoloji sxemi və onun iş prinsipi**

Xəzər dənizi suyunun şirinləşdirilməsi məqsədilə aşağıdakı mərhələlərin tətbiqi nəzərdə tutulur:

- Mexaniki qatışıqlardan təmizlənmə;
- Na-kationlaşdırma üsulu ilə yumşaldılma;
- MSF qurğusunda şirinləşdirmə.

Qeyd olunan mərhələləri əhatə edən suyun şirinləşdirilməsi qurğusunun texnoloji sxemi şəkil 1-də verilmişdir.




Şəkil 1. Na+MSF qurğusunun texnoloji sxemi

Təklif edilən sxemin iş prinsipinə görə dəniz (xam) suyu (XS) xam su çəninə (XSÇ) yığılır. Buradan nasos (1) vasitəsilə antrasitlə yüklənmiş süzgəcə (MS) ötürülür. Süzücü təbəqədən

süzülərək şəffaflaşdırılır. Bu suyun bir hissəsi yuma çənləri (YÇ1) və (YÇ2)-yə yığılır. YÇ1 mexaniki süzgəcin, YÇ2 isə Na-kationit süzgəcinin yuyulması üçün nəzərdə tutulub. Şəffaflaşdırılmış suyun əsas hissəsi Na-kationit süzgəcindən (Na) keçərək yumşaldılır və (YSÇ) çəninə yığılır. Buradan su nasos (5)-lə MSF qurğusu (6)-nın dövrü xəttinə verilir. MSF-in sonuncu pilləsi (10)-dan üflənən suyun bir hissəsi nasos (17) vasitəsilə dövrü kontura resirkulyasiya olunur, qalan hissəsi (13) isə Na-kationit süzgəcinin regenerasiyasına istifadə etmək üçün regenerasiya məhlulu çəninə (RMÇ) göndərilir.

Ani qaynama qurğusunda proses yüksək temperatur altında getdiyi üçün ərplərin ($CaCO_3$, $CaSO_4$, $Mg(OH)_2$) yaranmasının qarşısını almaq məqsədilə şirinləşdirilən suyun yumşaldılması aparılır və buna əsaslanaraq suyun konsentrasiyasının qatılaşma mislini 2,5÷3-dən 8÷10-dək artırmaq olar. Qeyd etmək lazımdır ki, üflənən suda $NaCl+Na_2SO_4$ duzlarının konsentrasiyası 9,6÷10% təşkil etdiyindən bu su Na-kationit süzgəcinin regenerasiyası üçün tam yararlıdır (Slesarenko, 1999). Əsas qızdırıcı (14) qismində util-qazan (UQ) təklif olunur ki, buraya stansiyanın yanma məhsulları verilir. Əsas qızdırıcıda yanma məhsullarının tullantı istiliyi (12) hesabına yumşaldılmış dəniz suyu qızdırılır və MSF-in birinci pilləsinin buxarlanma kamerasına verilir. Birinci pillədən üflənən su (15) ikinci pillənin bəsləyici suyudur. Beləliklə, hər pilləyə verilən su buxar qarışığından buxarlanma kamerasında buxar (16) ayrılaraq separator (8)-dən keçərək (7)-nin vasitəsilə kondensatlaşır və distillat təknəsi (9)-a yığılır. Oradan distillat çəni (DÇ)-yə ötürülür və şirinləşdirilmiş su nasos (11)-lə təlabatçıya göndərilir. Temperaturu aşağı salınmış (160÷170°C) tüstü qazları (13) atmosferə atılır.

**3. Şirinləşdirmə texnologiyasının hesablama metodikası**

Təklif olunan sxemin hesablanma-analitik tədqiqinin yerinə yetirilməsi məqsədilə qurulmuş riyazi hesablama metodikası aşağıda təklif olunur. Burada əsasən maddi və istilik balansı, reqressiya, gizli buxarlanma və s. tənliklərdən istifadə olunur. Util qazanda istiliyin gücü aşağıda verilmiş istilik balansı tənliyi ilə hesablanır, MVt:

$$Q_{UQ} = G_D(t_2 - t_1) \cdot C_p \cdot 10^{-3}, \qquad (1)$$

burada $G_D$ – util-qazanda dövr edərək qızdırılan duzlu suyun sərfidir, kq/san; $t_1$ və $t_2$ – uyğun olaraq util-qazanın giriş və çıxışında duzlu suyun temperaturlarıdır, $^0$C; $C_P$ – suyun xüsusi istilik temperaturudur, kVt/(kq·$^0$C).

Çoxpilləli MSF qurğusunun pillələrində temperatur düşküləri adətən eyni qəbul olunduğunu nəzərə alaraq məhsuldarlığı ($G_{Qur}$) belə hesablamaq mümkündür, kq/san (Feyziyev, 2009):

$$G_{Qur} = G_D(1 - (1 - C_p \cdot \frac{\Delta t_{pil}}{r_{or}})^n), \qquad (2)$$

burada $\Delta t_{pil}$ – hər pillədə temperatur düşküsüdür, $^0$C:

$$\Delta t_{pil} = \frac{t_2 - t_{üf}}{n} , \qquad (3)$$

burada $t_{üf}$ – sonuncu pillədən üflənən məhlulun temperaturudur, $^0$C; n – buxarlanma pillələrinin sayıdır; $r_{or}$ – gizli buxarlanma istiliyinin orta qiymətidir və regressiya tənliyindən belə hesablanır, kC/kq (Vatten.ru):

$$r_{or} = 2501{,}9 - 2{,}407t_{or} + 1{,}19222 \cdot 10^{-3}t_{or}^2 - 1{,}5863 \cdot 10^{-5} \cdot t_{or}^3 , \qquad (4)$$

burada $t_{or}$ – hər pillənin orta temperaturudur,$^0$C.

Dövr edən duzlu (dəniz) suyun hər i-ci pillənin çıxışındakı temperaturunun hesablanması verilmiş tənliklə aparılır, $^0$C:

$$t_2 = t_i + (n - (i - 1) \cdot \Delta t_{pil} \quad (5)$$

MSF-in maddi və istilik balans tənlikləri:

$$G_D = G_{Res} + G_{YS} \quad (6)$$
$$G_D \cdot S_D = G_{Res} \cdot S_{üf} + G_{YS} \cdot S_{YS} \quad (7)$$
$$G_D \cdot C_p \cdot t_D = G_{Res} \cdot C_p \cdot t_{üf} + G_{YS} \cdot C_p \cdot t_{YS}\ , \quad (8)$$

burada $G_{Res}$ və $G_{YS}$ – uyğun olaraq qurğuda resirkulyasiya edən və qurğuya verilən yumşaldılmış suların sərfləridir, kq/san; $S_D$ və $S_{üf}$ – uyğun olaraq bütün sistemdə dövr edən və sistemdən üflənən suların duzluluq göstəriciləridir, mq/dm$^3$; $t_D$ və $t_{YS}$ – ümumi sistemdə dövr edən və yumşaldılmış suların temperaturlarıdır, $^0$C.

MSF qurğusunda alınan distillə olunmuş suyun temperaturunun təyini, $^0$C:

$$t_{Dis} = t_{üf} - \Delta i, \quad (9)$$

burada Δi – fiziki-kimyəvi temperatur depressiyasıdır, hər i-ci pillə üçün verilmiş düsturla hesablanır [8]:

$$\Delta i = S_i \cdot 10^3 \cdot (M_i + S_i \cdot 10^3) \cdot L_i \cdot 10^{-3}, \quad (10)$$

burada $M_i$ və $L_i$ – dəqiqləşdirmə əmsallarıdır:

$$M_i = (6{,}71 + 6{,}34 \cdot 10^{-2} \cdot t_{iüf} + 9{,}74 \cdot 10^{-5} \cdot t_{iüf}^2) \cdot 10^{-3} \quad (11)$$
$$L_i = (22{,}238 + 9{,}57 \cdot 10^{-3} t_{iüf} + 9{,}42 \cdot 10^{-5} t_{iüf}^2) \cdot 10^{-8}\ , \quad (12)$$

burada $t_{iüf}$ – hər i-ci pillədən üflənən suyun temperaturudur, $^0$C:

$$t_{iüf} = t_2 - i\Delta t_{pil}\ ,\ i=1.....n \quad (13)$$

Riyazi hesablamaya util qazanın istilik ötürmə tənliyi də daxildir,Vt/(m$^2$k):

$$Q_{UQ} = F_{UQ} \cdot K_{UQ} \cdot \Delta t_{UQ}\ , \quad (14)$$

burada $F_{UQ}$ – util-qazanın qızma səthinin sahəsidir, m$^2$/(kq/san); $K_{UQ}$ – util-qazanın istilik ötürmə əmsalıdır, Vt/(m$^2$·K); $\Delta t_{UQ}$ – util-qazanda temperatur basqısıdır, $^0$C.

Hesablama metodikası əsasında kompüter proqramının işlənilməsi təklif edilir. Proqramın köməkliyi ilə sistemin əsas giriş faktorlarının onun texnoloji çıxış göstəricilərinə təsiri tədqiq oluna bilər. Giriş faktorlarının dəyişmə diapazonu belədir:

- UQ-nın çıxışında dəniz (duzlu) suyunun temperaturu: $t_2$=110÷160 $^0$C;
- MSF-in sonuncu pilləsindən üflənən suyun temperaturu: $t_{üf}$=40÷100 $^0$C;
- MSF-in buxarlandırıcı pillələrin (kameralarının) sayı: n=1÷20;
- Utilizə olunan istiliyin miqdarı: $Q_{UQ}$=6÷16 MVt;
- Sonuncu pillədən üflənən suyun duruluğu: $S_{üf}$=70÷110 q/dm$^3$.

Hesablama mərhələsinin sonunda dizel elektrik stansiyasının ikinci enerji ehtiyatlarının istilik potensialının energetik səmərəlilik göstəricisinin hesablanma düsturu təklif edilir, kq/MC:

$$\eta_{ener} = G_{Qur}/Q_{UQ} \quad (15)$$

Məqalənin sonunda qeyd etmək vacibdir ki, aparılan tədqiqatların nəticələrinə görə dəniz suyunun Na-kationlaşdırma ilə yumşaldılması sayəsində istilik mübadilə səthlərində ərpin

yaranması təhlükəsi olmadan MSF-in üflənən suyunun konsentrasiyasını 100÷200 q/dm$^3$-dək artırmaq mümkündür.

## Nəticə

Səngəçal dizel elektrik stansiyasının tullantı istiliyi hesabına Xəzər dənizi suyunun az xərclərlə şirinləşdirilməsi əldə oluna bilər. Stansiyanın ikinci enerji ehtiyatlarından istifadə etməklə atmosferə atılan tüstü qazlarının temperaturunu 400÷500°C-dən 160÷170°C-dək endirməklə istixana effekti yaradan qazların (SOx, NOx və s.) emissiyasını azaltmaq mümkündür. Çoxpilləli ani qaynama qurğusu seçməklə suyun distillə texnologiyasının səmərəliliyini artırmaq olar.

Qeyd etmək lazımdır ki, təklif olunan şirinləşdirmə texnologiyası ilə Xəzər dənizi suyu ilə yanaşı, həm də digər su mənbələrinin sularının (yeraltı şoran, çay və s.) şirinləşdirilməsi aparıla bilər.

## Ədəbiyyat

1. Abdullayev, K. M. (2010). Perspektivi ispolzovaniya vtorichnikh energoresursov dlya opresneniya mineralizovannikh vod na Apsherone. In Tezis doklada Mezhdunarodnoy Nauchnoy Konferensyy “Neft-qaz, Neftepereabotka i Neftekhimiya”. Bakı, 235.
2. Abdullayev, K. M., Axmedova, D. A., Aqamaliyev, M. M. (2010). Texnologiya kombinirovannoqo opresneniya mineralizovannıx vod s ispolzovaniem vtorichnikh energoresursov dizelnikh elektrostansiy modulnogo tipa. Energetikanın Problemləri, (2), 33–46.
3. El-Dessouky, H. T., Ettouney, H. M. (2002). Fundamentals of salt water desalination. Elsevier.
4. Feyziyev, Q. K. (2009). Visokoeffektivniye metodi umyegcheniya i obessolivaniya vodi (2-izd.). Bakı: Tahsil TPP.
5. Report.az. (2025). V 2025 godu mozhet usugubit'sya problema s pit'yevoy vodoy. https://report.az/ru/ekologiya/v-2025
6. Satbayev University. (n.d.). Problema pit'yevoy vody. https://satbayev.university/ru/news/problema-pitevoy-vody
7. Slesarenko, V. N. (1999). Opresnitelniye ustanovki. Vladivostok: DVQMA.
8. Vatten.ru. (n.d.). Opresneniye vody – izvestnyye metody. https://vatten.ru/knowns/water-desalination.

Daxil oldu: 29.11.2024
Qəbul edildi: 04.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/256-262

**Aysel Həmzəyeva**
Gəncə Dövlət Universiteti
fizika üzrə fəlsəfə doktoru
https://orcid.org/0009-0002-3219-6776
ayselhemzeyeva15@gmail.com

# ASPE+xhəcm%$Bi_2Te_3$ kompozitlərin optik sabitlərinin hesablanması

## Xülasə

Məqalədə aşağı sıxlıqlı polietilenə $Bi_2Te_3$ birləşməsindən əlavələr etməklə alınmış kompozitlərdə optik sabitlərin tədqiqi barədə məlumatlar verilmişdir. Tədqiqatda kompozit materialların sındırma əmsalının həqiqi (n) və xəyali (k) hissələri, udma (α) və qayıtma (R) əmsalları, elektrik enerji itkiləri, optik elektrik keçiriciliklərinin həqiqi və xəyali hissələrinin tezlikdən asılılığının nəzəri üsulla nəticələri hesablanmışdır. Alınan nəticələr göstərir ki, $Bi_2Te_3$ doldurucusunun konsentrasiyası artdıqca kompozit materialların dielektrik nüfuzluğunun həqiqi və xəyali hissələrinə əsasən hesablanmış optik sabitlər müəyyən dəyişikliklərə məruz qalır. Çox ehtimal ki, bu $Bi_2Te_3$ doldurucusunun həcm payının artması ilə kompozitin səthində onlara düşən payı, yəni onların yaratdıqları klasterlərin artmasının nəticəsi kimi izah oluna bilər. Kompozit materialların optik sabitlərinin düzgün hesablanması, bu materialların daha səmərəli şəkildə istifadə olunmasını təmin edir və onların optik texnologiyalarda fotonika, optik kabellər, lazer sistemləri və günəş enerjisi tətbiqlərində effektivliyini artırır.

***Açar sözlər:*** *aşağı sıxlıqlı polietilen, $Bi_2Te_3$, kompozit materiallar, optik sabitlər*

**Aysel Hamzayeva**
Ganja State University
PhD in Physics
https://orcid.org/0009-0002-3219-6776
ayselhemzeyeva15@gmail.com

# Calculation of Optical Constants of ASPE+xvol%Bi2Te3 Composites

## Abstract

The article provides information on the study of optical constants in composites obtained by adding $Bi_2Te_3$ compounds to low-density polyethylene. In the study, the real (n) and imaginary (k) parts of the refractive index of composite materials, absorption (α) and reflection (R) coefficients, electrical energy losses and frequency dependence of the real and imaginary parts of optical electrical conductivity were theoretically calculated. The obtained results show that as the concentration of $Bi_2Te_3$ filler increases, the optical constants calculated according to the real and imaginary parts of the dielectric permittivity of composite materials undergo certain changes. Most likely, this can be explained by the increase in the volume fraction of $Bi_2Te_3$ filler and the increase in their share on the composite surface, i.e. the clusters they form. Correct calculation of optical constants of composite materials allows more efficient use of these materials and increases their effectiveness in optical technologies, photonics, optical cables, laser systems and solar energy applications.

***Keywords:*** *low-density polyethylene, $Bi_2Te_3$, composite materials, optical constants*

## Giriş

Məlum olduğu kimi, dielektrik nüfuzluğunun xəyali hissəsi işığın udulması ilə birbaşa əlaqədardır. Elektronlar $\hbar\omega$ enerjili fotonu udduqda dalğa vektorlu elektronların valent zonasından keçirici zonaya keçməsi baş verir. Tamamilə aydındır ki, işığın udulması bu keçidlərin ehtimalı ilə

birbaşa əlaqədardır. Ona görə də, dielektrik nüfuzluğunun xəyali hissəsi optik tezlik diapazonunda valent zonası ilə keçiricilik zonası arasındakı optik keçidlərinin hal sıxlıqlarını təyin etməyə imkan verir. Kompleks dielektrik nüfuzluğunun xəyali hissəsinin tezlikdən asılılığını təyin etmək üçün (Lushcheykin, Petrov, 1981)-də təklif olunan münasibətdən və (Kafarova, Kerimova, Safarova, et al., 2004)-də təklif olunan üsuldan istifadə edilmişdir.

$$\varepsilon_i(E) = \frac{N}{E^2} \sum_{k \in BZ} \sum_{v_i c} \left| \vec{e} \cdot \vec{M}_c(\vec{k}) \right|^2 \delta\left(E_c(\vec{k}) - E_v(\vec{k}) - E\right) \qquad (1)$$

burada $M_e$ -elektronun kütləsi, $e$ -yükü, $E$ -düşən elektromaqnit dalğasında fotonun enerjisi, $\vec{k}$ -dalğa vektoru, $\vec{e}$ -vahid vektor (polyarlaşma vektoru),
$M_{cv}(\vec{k}) - (\vec{p} = -i\hbar\nabla)$ impuls operatorunun matris elementidir.

$$\vec{e} \cdot \vec{M}_{cv}(\vec{k}) = \left\langle \psi_{ck}(\vec{r}) \middle| \vec{e} \cdot \vec{p} \middle| \psi_{vk}(\vec{r}) \right\rangle = \vec{e} \cdot \int \psi^*_{cv}(\vec{r})(-i\hbar\nabla)\psi_{vk}(\vec{r}) d^3\vec{r} \qquad (2)$$

$\psi_{ck}$ və $\psi_{vk}$ müvafiq olaraq keçiricilik və valent zonalarında elektronların hal funksiyaları, $\hbar = \frac{h}{2\pi}$; $h$ -Plank sabitidir. $v$ və $c$ - indeksləri valent və keçiricilik zonalarını ifadə edir (Khayal, Muheddin, Mohammed, Ezat, Murad, Ahmed, Hussen, Ahmed, Hamad, Abdullah, Aziz, 2024). $N$ -normalaşdırıcı vuruğu aşağıdakı normalama şərtindən tapılır:

$$\int_0^\infty E\varepsilon_i(E)dE = \frac{\pi}{2\hbar^2}\omega_p^2 = \frac{\pi}{2\hbar^2} \cdot \frac{4\pi n_e e^2}{m_e} \qquad (3)$$

burada $\omega_p$ -elektronlar üçün plazmon tezliyi, $m_e$ - elektronun kütləsi, $n_e$ -kristalda elektronların orta sıxlığıdır. Histoqramma təxminən 0.2eV addımla qurulmuş və 6eV enerjiyə qədər bütün $v \rightarrow c$ keçidləri nəzərə alınmışdır (Chiang, Leung, Tse, 1997), (Voshchinnikov, Il'in, Henning, 2005). 6eV-dan yüksək enerjilərdə $\varepsilon_i(E)$ asılılığı məlum $\varepsilon_i(E)\big|_{E\to\infty} \approx E^{-3}$ düsturu ilə ekstrapolyasiya edilmişdir. Dielektrik nüfuzluğunun real hissəsi Kramers-Kroniqin inteqral dispersion münasibəti ilə hesablanmışdır (Hlubina, Ciprian, Lunacek, 2009; Ren, Chow, Meng, Wang, Lu, Ma, Wang, Xu, Gambling, 2001).

$$\varepsilon_r(E) = 1 + \frac{2}{\pi} P \int_0^\infty E' \varepsilon_i(E') \cdot \frac{dE'}{E'^2 - E^2}, \qquad (4)$$

burada P-simvolu ilə inteqralın baş qiyməti ifadə edilir (Ponyavina, Kachan, Tselesh, 2012). $E \leq \hbar\omega$ enerjili keçidlərdə iştirak edən bir atoma düşən valent elektronlarının effektiv sayı

$$n_{eff}(E) = \frac{m_e}{2\pi^2 e^2 \hbar^2} \cdot \frac{1}{n_a} \int_0^E \varepsilon_i(E')E'dE' \qquad (5)$$

düsturu ilə hesablana bilər (Potter 1965; Sajnani, Hegde, Shetty, 2014; Brako 1997). Burada $n_a$ -kristalda atomların sıxlığını ifadə edir. Əsas sındırma əmsalı (sındırma əmsalının həqiqi hissəsi)

$$n = \sqrt{\frac{1}{2}\left(\varepsilon_r + \sqrt{\varepsilon_r^2 + \varepsilon_i^2}\right)} \qquad (6)$$

ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin sındırma əmsalının həqiqi qiymətinin tezlikdən asılılığı şəkil 1-də verilmişdir. Kompozitlərin sındırma əmsalının həqiqi qiymətinin tezlikdən asılılıqları (Abeles, 1978).

$$\rho_{Bi2Te3}\frac{\varepsilon_{Bi2Te3} - \varepsilon_{ef}}{\varepsilon_{Bi2Te3} + 2\varepsilon_{ef}} + \rho_{PE}\frac{\varepsilon_{PE} - \varepsilon_{ef}}{\varepsilon_{PE} + 2\varepsilon_{ef}} = 0$$

düsturu ilə hesablanmışdır.

Tədqiqatlar 5, 10, 15 və 20 həcm % $Bi_2Te_3$ tərkibli kompozitlərdə aparılmışdır. Şəkildən göründüyü kimi sındırma əmsalı bütün tezlik oblastında (0-5)kHs oblastında artır. Bu artma tezliyi 3500-3730 Hs intervalında nisbətən kəskin olur, amma ümumilikdə sındırma əmsalı bütün tezlik diapazonunda artır.




**Şəkil 1.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin sındırma əmsallarının həqiqi hissəsinin tezlikdən asılılıqları:1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

Kompozitlərin sındırma əmsalının xəyali qiymətinin tezlikdən asılılıqları aşağıdakı düstur ilə hesablanmışdır:

$$k = \sqrt{\frac{1}{2}\left(-\varepsilon_r + \sqrt{\varepsilon_r^2 + \varepsilon_i^2}\right)} \qquad (7)$$

Sındırma əmsalının xəyali hissəsi üçün də artma bütün tezlik diapazonunda müşahidə edilir (şəkil 2). Amma 3500-3730 Hs tezlik diapazonunda k-nın artması kəskin olur, digər tezlik diapazonlarında k-nın monoton olaraq artması müşahidə edilir.




**Şəkil 2.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin sındırma əmsallarının xəyali hissəsinin tezlikdən asılılıqları: 1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

Udma əmsalı (8) düsturu ilə hesablanmış və alınmış nəticələr şəkil 3-də verilib. Göründüyü kimi tədqiq olunan tezlik diapazonunda, 3500-3730 Hs tezlik diapazonu istisna olmaqla bütün tezlik diapazonunda α(ν) asılılığı xəttidir.

$$\alpha(\omega) = \frac{4\pi}{\lambda}k(\omega) = \frac{2}{c}\omega k \quad (8)$$




**Şəkil 3.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin udma əmsallarının tezlikdən asılılıqları:1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

Kompozitlərin (R) qaytarma əmsalı

$$R = \frac{(n-1)^2 + k^2}{(n+1)^2 + k^2} \quad (9)$$

düsturu ilə hesablanmışdır. Şəkil 4-də verilmiş nəticələrə görə tərkibində 5, 10həcm%$Bi_2Te_3$ doldurucusu olan kompozitlər üçün R(ν) asılılığının xarakteri eynidir. Yəni, tədqiq olunan bütün tezlik diapazonunda qaytarma əmsalı tezliyin artması ilə xətti qanunla artır. Amma tərkibində $Bi_2Te_3$ doldurucusunun miqdarı 15, 20həcm%$Bi_2Te_3$ olan nümunələrdə yüksək 3730-4800 Hs tezlik diapazonunda qaytarma əmsalının daha kəskin artması aşkar edilib. 4800Hs tezlikdə tərkibində 5 həcm%$Bi_2Te_3$ əlavəsi olan kompozitin qaytarma əmsalı 0,08 olduğu halda, elə həmin tezlikdə 20




**Şəkil 4.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin qaytarma əmsallarının tezlikdən asılılıqları: 1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

həcm%$Bi_2Te_3$-ə uyğun kompozitdə bu əmsal 0,24 olmuşdur.

Elektronların enerji itkisinin xarakterik funksiyasının tezlikdən asılı olaraq dəyişməsi ASPE+xhəcm%$Bi_2Te_3$ kompozitləri üçün şəkil 5-də verilmiş və

$$-\dot{I}_m\left(\frac{1}{\varepsilon}\right)=\frac{\varepsilon_i}{\varepsilon_r^2+\varepsilon_i^2} \quad (10)$$

düsturu ilə hesablanmışdır.




**Şəkil 5.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin elektrik enerji itkilərinin tezlikdən asılılıqları: 1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

Göründüyü kimi tədqiq olunan bütün kompozitlər üçün tezliyin 3200-3500 Hs intervalında dəyişməsi zamanı enerji itkisinin kəskin azalması, 3600 Hs tezliyi ətrafında xarakterik olaraq bütün nümunələrdə aydın ifadə olunmuş maksimumlar, tezliyin sonrakı artması halında isə enerji itkisinin cüzi dəyişməsi aşkar edilmişdir.

Dielektrik nüfuzluğunun məlum qiymətlərinə əsasən kompozitlərin optik elektrik keçiriciliklərinin həqiqi və xəyali hissələri də hesablanmışdır. Hesablamalar (11) və (12) düsturları ilə aparılmış və nəticələr şəkil 6 və 7-də verilmişdir.

$$\sigma_r=\frac{\omega\varepsilon_i}{4\pi} \quad (11)$$

$$\sigma_i=-\frac{\omega\varepsilon_r}{4\pi} \quad (12)$$




**Şəkil 6.** ASPE+xhəcm%$Bi_2Te_3$kompozitlərin optik keçiriciliklərinin həqiqi hissələrinin tezlikdən asılılıqları: 1-x=5; 2-x=10; 3-x=15; 4-x=20;

İnformasiya təminatı (IT - ing. *Information support*) informasiya sisteminin və informasiya texnologiyalarının mühüm elementlərindən biri kimi idarə olunan bütün obyektləri xarakterizə edir, məlumatın əks etdirilməsi və idarəçilik qərarlarının qəbul edilməsi qismində təzahür edir. Məlumdur ki, informasiya ətraf mühitdə və məlumat məkanında cərəyan edən dəyişikliklər haqqında verilənlərin külliyatıdır. İnformasiya özündə əks etdirdiyi hadisələrin və proseslərin kəmiyyət xüsusiyyətlərini və məntiqi obrazını ifadə edir. İnformasiya texnologiyalarında informasiya müəyyən əlamətləri üzrə birləşən və məlumat massivi (fayl) yaradan eyni növ sənədlərin spesifik qrupu kimi qəbul olunur. Qeyd edək ki, informasiya texnologiyaları sahəsində məlumatların yerləşdiyi fayl avtomatlaşdırılmış emal prosesində başlıca struktur vahidi kimi çıxış edir. İnformasiyaların emalı zamanı rekvizit əlamətlər və rekvizit əsaslar "verilənlər" qismində xarakterizə olunur. Bir qayda olaraq, formalizə olunmuş şəkildə ayrı-ayrı daşıyıcılarda yerləşən və emal üçün həmişə hazır olan və ötürülə bilən məlumatları "verilənlər" adlandırmaq qəbul olunmuşdur (Vines, Albert, Andrew, Rose, Debarre, 2014, s. 95). Bu gün müasir cəmiyyətin lokomotivi sayılan informasiya ən müxtəlif əlamət və xüsusiyyətlərinə görə sinifləşdirilir: 1. Yaranma mənbəyinə görə: ilkin və törəmə (aralıq, komanda, hesabat) informasiyalar. 9. Yaranma vaxtına görə: keçmiş, cari, gələcək informasiyalar. 8. Fəaliyyət sferalarına mənsubiyyətinə görə: maliyyə, texnoloji, konstruktor, mühasibat, planlaşdırma, operativ-istehsal. 3. İfadə olunması üsullarına görə: rəqəmsal və əlifba. 2. Fiksasiya olunması üsullarına görə: şifahi və sənədli. 5. Hərəkət istiqamətlərinə görə: giriş və çıxış informasiyaları. 4. Verilənlərin fiksasiyasının xarakterinə görə: fiksasiya olunan və fiksasiya olunmayan. 7. İdarəçilik sistemində icra etdiyi funksiyalara görə. 6. Sabitlik vəziyyətinə görə: dəyişən və şərti-daimi informasiyalar.

İnformasiya təminatı özündə göstəricilərin vahid sistemini ifadə edir. Onlardan ən mühüm olanları aşağıda qeyd edilmişdir:

- informasiya axını - sənəd dövriyyəsinin təşkili variantları;
- iqtisadi məlumatların sinifləşdirilməsi və kodlaşdırılması sistemi;
- sənədləşdirmənin inifikasiya olunmuş sistemi;
- maşında və maşınlı daşıyıcılarda saxlanılan müxtəlif təşkilati səviyyədə çeşidli məlumat massivləri (fayllar).

Qeyd etmək lazımdır ki, informasiya təminatının maşındankənar və maşındaxili növləri vardır. Maşındankənar informasiya təminatı iqtisadi göstəricilərin sistemini, sinifləşdirmə-kodlaşdırma sistemlərini və sənədləşdirməni müəyyən edir. Maşındaxili informasiya təminatı isə özündə özəl qaydada təşkil olunan, texniki vasitələrə uyğun avtomat rejimdə axtarılan, emal olunan, toplanan, saxlanılan verilənləri birləşdirir (Turuqulova, Vesirkepova, Bükseytova, Kabdoldina, 2016, s. 352).

Müasir informasiya təminatında göstəricilər sistemi bir-biri ilə qarşılıqlı əlaqədə olan informasiya sistemlərində müvafiq vəzifələri icra edən sosial, iqtisadi və texniki komponentlərə əsaslanır. Sinifləşdirmə və kodlaşdırma sistemi isə məlumatın maşın tərəfindən mavafiq qaydada qəbul olunan formaya salınmasını icra edir. İnformasiya təminatı sistemində bəhsi gedən prosedurlar klassifikator (eyni növdən olan adların, başqa sözlə, sinifləşdirilmiş obyektlərin kodlarla ifadə olunan və konkret nizama tam uyğun olan sistemli məcmusudur), kod (özəl kodlaşdırma sistemləri tərəfindən təyin edilən müəyyən qaydalar əsasında obyektin, şərti işarələrlə, yaxud işarələr qrupu ilə müəyyən edilməsi) və identifikator (müvafiq sənədlərin rekvizitlərinin latın və yaxud kiril əlifbasının hərflərilə şərti qaydada müəyyən edilməsi) vasitəsilə həyata keçirilir.

Yuxarıda təqdim olunanlardan başqa informasiya təminatında sənədləşdirmənin unifikasiya olunmuş sistemi də mühüm rol oynayır. Bu sistem idarəçilik funksiyaları ilə icra olunur və qərarların qəbul edilməsi üçün zəruri olan informasiyaları dəyişir, təhlil edir və adekvat şəkildə qiymətləndirir. Bu zaman başlıca informasiya daşıyıcısı rolunu sənəd (əvvəlcədən qeydiyyata alınmış, konkret qaydada formalaşdırılmış və mövcud qanunvericiliyə uyğun hüquqi əhəmiyyət kəsb edən informasiya daşıyıcısı) oynayır.

İnformasiya təminatının dayanıqlı formada həyata keçirilməsində "Verilənlər Bazasının İdarə Olunması Sistemi" (ing. *Database Management System*) xüsusi və həlledici rol oynayır və aşağıdakı funksiyaları yerinə yetirir:

- xarici yaddaşda verilənlərin bilavasitə idarə olunması;
- operativ yaddaşın buferlərinin idarə olunması;
- tranzaksiyaların idarə olunması;

- jurnalizasiyanın həyata keçirilməsi;
- verilənlər bazasının dillərinin müəyyən edilməsi.

İnformasiya təminatında verilənlər anbarı (ing. *data warehose*) da əhəmiyyətli rol oynayır. Verilənlər anbarı avtomatlaşdırılmış məlumat-texnoloji sistem qismində mövcud bazalardan və xarici mənbələrdən verilənləri toplayır, formalaşdırır, saxlayır və ümumi qaydalara uyğun istismar edir. VA inteqrasiya olunmuş informasiyaların etibarlı şəkildə saxlanması, operativ şəkildə əldə olunması və təhlil edilməsi işini icra edir (Paiho, Tuominen, Rökman, Ylikerälä, Pajula, Siikavirta, 2022, s. 276). Beləliklə, etibarlı informasiya təminatı işi təşkil olunur.

İnformasiya təminatında daha bir vacib element ekspert sistemidir (ing. *expert system*). Ekspert sistemi insan tərəfindən qəbul olunan qərarların formaya salınması prosesi üzrə kompüter proqramıdır. Yaxın perspektivdə ekspert sisteminin qurulması süni intellektdən istifadə eməklə həyata keçiriləcək. Ekspert sisteminin təyin edilməsi situasiyaya uyğun məsləhətlərin hazırlanması və təqdim edilməsi aktıdır. Orada, bir qayda olaraq, məlumatlar toplusu, həmçinin istifadəçilər tərəfindən dialoq rejimində daxil edilən verilənlər əksini tapır. Bununla belə, maşın tərəfindən verilən məsləhətlər yüksək səriştəli mütəxəssisin rəyləri ilə üst-üstə düşməlidir.

Yuxarıda qeyd olunanlardan belə bir nəticə çıxır ki, informasiya təminatı son dərəcə vacib funksiyaları icra etməklə cəmiyyət həyatının bütün sahələrində fəaliyyət rejimini maksimum optimallaşdırır və informasiya prioritetlərini ümumi normativlərə uyğun müəyyən edir.

Bu gün cəmiyyət həyatının informasiya təminatının təşkil edilməsində kompleks avtomatlaşdırılmış sistemin yaradılması xüsusi əhəmiyyət kəsb edir və bu iş aşağıda qeyd olunmuş vacib məqamları nəzərdə tutur: kompüter avadanlıqlarının qurulması – müvafiq işçi stansiyaların yaradılması, printerlərin, serverlərin və şəbəkə qurğularının hazırlanması, fasiləsiz elektrik təminatının təşkili və verilənlərin rezerv kopiyasının (rezerv nüsxəsinin) formalaşdırılması. Bu və çox sayda başqa komponentlərin yüksək səviyyədə təşkil edildiyi informasiya mühitində növbəti mühüm məqam “relevantlıq” (ing. *relevant* - vacib) adlanan fenomenlə bağlıdır. Relevantlıq - məlumat məkanında informasiya axtarışı zamanı istifadəçilərin axtarıb tapdığı sənədin və yaxud sənədlər külliyatının onun tələb və ehtiyaclarına uyğunluğunun səviyyəsini ifadə edən mühüm elementdir. Beləliklə, informasiya sahəsində relevantlıq nisbətin və uyğunluğun əsas ölçüsünü bildirir. Relevantlığın meyarları informasiya ilə bağlı ayrı-ayrı hadisələrin kəmiyyət-keyfiyyət dəyərini müəyyən etmək üçün istifadə olunur. Məsələn, istifadəçi informasiyanın bu və ya digər xassəsinin (faydalılıq, vaciblik və aktuallıq) tapşırığa, sorğuya və cari situasiyaya uyğun olmasına qiymət verdiyi zaman (Jodłowiec, 2015, s. 25).

**Süni intellekt, onun məzmunu və xüsusiyyətləri**

Müasir informasiya cəmiyyətində ən aktual mövzulardan biri də süni intellekt, onun cəmiyyət həyatında, insanın professional fəaliyyətində oynadığı rolla bağlıdır. Süni intellekt (ing. *Artificial Intelligence, AI*) ən geniş mənada maşınla, xüsusilə də kompüter sistemi ilə təqdim olunan intellektdir. O, həm də yeni kompüter elmlərində spesifik tədqiqat sahəsidir və proqram təminatı ilə bağlı xüsusi metodiki tapşırıqların icrası ilə məşğul olur. Bu sahədə aparılan tədqiqatların və praktiki çalışmaların əsas məqsədi isə yeni nəsil aparıcı informasiya texnologiyaları əsasında gerçəkliyi və ətraf mühiti rəqəmsal formatda qəbul edən supermüasir intellektual aparat, intellektin və təlimin yaradıcı gücündən istifadə etməklə müvafiq hərəkətləri yüksək diqiqliklə icra edən mexanizm xüsusi yaratmaq və bununla da idraki mükəmməlliyi yeni səviyyəyə qaldırmaqdır. Məhz bu vəzifələri yerinə yetirən maşın, mexanizm, rəqəmsal proqram və s. süni intellektin daşıyıcısı və icraçısı hesab olunur (Rassel, 2021, s. 18).

Süni intellekt özündə aparıcı texnologiyalar sahəsində öz populyarlığı ilə seçilən bir çox axtarış (məs., *Google Search*) və məsləhətçi (*Netflix*, *Amazon*, *YouTube* və s.) sistemləri, insan nitqi ilə idarə olunan xidməti mexanizmləri (məsələn, *Google, Siri, Alexa, Assistant* və b.), avtonom nəqliyyat vasitələrini, pilotsuz hərəkət edən maşın və aparatları, Smart qurğuları, kreativ və yaxud generativ (məs., *Apple Intelligence, Chat GPT*, süni intellekt sənəti) instrumentləri, dərin düşüncə tələb edən mürəkkəb strateji oyunların (məsələn, şahmat, paduk və yaxud go oyunu və s.) rəqəmsal variantlarını birləşdirir.

Məşhur ingilis riyaziyyatçısı, məntiqçisi, kriptoqraf Alan Metison Türinq (1912-1954) süni intellekt sahəsində ilk dəfə fundamental elmi tədqiqatlar aparmış alim və mütəxəssis hesab olunur (Matiyaskevich, 2013, s. 6). Əldə etdiyi nəticələri o, “maşın intellekti” adlandırmış və müvafiq qaydada xarakterizə etmişdir. XX yüzilliyin 50-ci illərində isə süni intellekt akademik səviyyəli təlim statusu qazanmışdır. Sözügedən bu təlimin ərsəyə gəlməsində müstəsna rolu və xidmətləri

olan və buna görə də "süni intellektin ataları" kimi tanınan Con Makkartni (1927-2011 - informatika sahəsində tanınmış ABŞ mütəxəssisi və "süni intellekt" termininin müəllifi), Marvin Li Minski (1927-2016 - "süni intellekt" sahəsində ABŞ alimi), Klod Elvud Şennon (1916-2001- məşhur ABŞ riyaziyyatçısı, kriptoqraf və mühəndis, "informasiya əsrinin atası" adını qazanmışdır) və Nataniel Roçester (1919-2001, "IBM 701" kimi tanınmış ilk kütləvi elmi kompüterin arxitektoru) insan idrakının, onun ziya komponentlərinin yeni, daha yüksək səviyyəyə çıxarılması mexanizmlərini işə salmışdılar. Onların başlatdığı iş bu gün sürətlə reallığa çevrilir, müasir qlobal cəmiyyətin məzmununu və perspektivlərini müəyyən etmək kimi möhtəşəm tarixi missiyanı icra edir. XXI əsrin II onilliyindən başlayaraq, müasir informasiya texnologiyalarının intensiv inkişaf mərhələsinə daxil olması ilə əlaqədar süni intellektin inkişafında güclü sıçrayış baş vermişdir. 2017-ci ildə "Transformer" (ing. *transformer* - elementlər arasında mövcud əlaqələrin ardıcıl yönlənmiş xətt kimi təzahür edən və rekkurent neyron şəbəkələrinin iştirakı olmadan "diqqət mexanizmi" üzərində qurulmuş dərin neyron şəbəkələrinin özəl arxitekturası) arxitekturasının yaranmasından sonra süni intellektin inkişafı əsl bum (fra. *la boum* - hər hansı predmet, hadisə və fakt ətrafında fövqəladə canlanma və ya həddindən artıq səs-küy) yaşamağa başladı. Qeyd edək ki, struktur və metod baxımından transformer rekkurent şəbəkə üzərində qurulan enkoder-dekoder (*enkoder* - bucaq yerdəyişməsini yenidən yaradan mexanizm, *dekoder* - informasiyaları bir xarici formatdan digərinə dəyişən mexanizm) mexanizminin analoqu kimi çıxış edir. Enkoderin girişinə çıxış dilində sözlər ardıcıl qaydada daxil edilir. Sözlərin vektorları özünədiqqət qatlarının ardıcıllığından keçir, cümlənin konteksti nəzərə alınmaqla dəyişir. Dekoder məcburi təlim (ing. *teacher forcing*) rejimində çıxışda yaddaşın verilənlərini və artıq tərcümə olunmuş cümlənin sözlərini alır. Dekoderə əvvəlcə xidməti söz "<BOS>" (ing. *begin of sentence* - cümlənin başlanğıcı), verilir, çıxışda "pişik" sözü gözlənilir. Daha sonra girişə "<BOS>pişik" sözləri daxil edilir, çıxışda "pişik oturub" sözləri alınır. Nəticə etibarı ilə dekoder "<EOS>" (ing. *and of sentence* - hökm oxunanadək) prosesi başa çatanadək həmin proseduru icra edir. Göründüyü kimi, enkoder və dekoder eynitipli blokların dəsti qismində giriş tenzorlarını (lat. *tensus* - "gərgin", - fizika və riyaziyyat sahəsində xətti cəbrin obyektidir, yekun ölçüləri olan vektor məkanında tətbiq edilir) dərindən dəyişdirir (Luxton, 2014, s. 331).

Müasir dövrdə süni intellektin inkişafında iki istiqaməti müəyyən edirlər:

1. Süni intellektin spesifik sistemlərinin insanın əqli və intellektual imkanlarına yaxınlaşdırılması və onların inteqrasiyası ilə bağlı problemin həlli.

2. Süni idraki sistemlərin inteqrasiyasını nəzərdə tutan və insanın ən çözülməz problemlərini belə, həll etməyə qadir olan süni şüurun yaradılması.

Qeyd edək ki, hazırda insan fəaliyyətinin ən müxtəlif sahələrində süni sistemlər fəaliyyət göstərir, məsələn, ChatGPT, OpenAL, AlpahaGo, Midjourney, Dedp Blue, MYCIN. Watson və s. Süni intellektin tətbiq olunduğu sahələr isə aşağıdakılardır: əl yazısının təyin edilməsi; simvolların optik təyin edilməsi; nitqin təyin edilməsi; elm, təhsil, tibb, səhiyyə, hərbi texnologiyalar; simaların (sifətlər) təyin edilməsi; rəqəmsal yaradıcılıq; kompüter görüntüsü, virtual reallıq, təsvirlərin emalı; süni həyat; sənaye və kənd təsərrüfatı; semantik hörümçək toru; avtomatlaşdırma; bank işi və maliyyə sistemi; dələduzluğun (xakerlər) aşkar edilməsi; verilənlərin hasilatı; virtual assistent. axtarış sistemləri; spamın filtrasiyası; virtual oyunlar; ticarət və investisiyalar; dövlət strukturları.

Süni intellektin geniş tətbiq olunduğu sahələrdən biri də tarnshumanizmdir (lat. *trans* - içindən və *homo* - insanlıq, - müasir elmin, texnologiyanın və süni intellektin nailiyyətlərindən istifadə etməklə insanların əqli və fiziki imkanlarının keyfiyyətini yaxşılaşdırmağı nəzərdə tutan konsepsiya). Transhumanizm ideyalarının daşıyıcıları hesab edir ki, insanları xəstəliklərdən, əzablardan, qocalıqdan və ölümdən, elmi və texniki imkanlar daxilində qurtarmaq insanlığın ali vəzifəsi olmalıdır (Kavrorv, 2015, s. 57). Transhumaizmin prinsipial məqamlarından biri də təbii və süni intellektin, dəqiq və təbiət elmlərinin nailiyyətlərinə əsaslanaraq, fiziki ölümdən qurtulmaq və ya onun baş verməsini maksimum uzaqlaşdırmağa nail olmaqdır. Bioloji ölümsüzlüyü nəzərdə tutan bu fenomen müasir elmi leksikonuna *"immortalizm"* (lat. *immortalitas* - ölümsüzlük) kimi daxil olmuşdur.

## Nəticə

Bu gün uğurlu gələcəyin qurulmasında və gələcək nəsillərin davamlı rifahının və

təhlükəsizliyinin etibarlı şəkildə zəmanət altına alınmasında iştirak edən ən mühüm elementlərdən biri sayılan informasiya və informasiya təminatı gündəlik həyatımızın ayrılmaz hissəsinə çevrilib. O, pozitiv anlamda düşüncələrimizə və davranışlarımıza hakim kəsilərək, müvafiq qərarlar qəbul etməkdə və adekvat seçim etməkdə bizim əvəzolunmaz bələdçimiz kimi özünü təsdiq edib. İnformasiya və informasiya təminatı ilə bağlı müasir vəziyyəti təhlil edəndə yaxın və uzaq gələcəkdə də onların gündəlik həyatımızın əsas məzmunu olacağına hər hansı bir şübhə qalmır. Əqli-intellektual və texniki-mədəni baxımdan gələcək rifahımızı, elmi-texniki, təsərrüfat-iqtisadi, sosial-mədəni və ruhani-mənəvi sahələrdə uğurlarımızı yüksək səviyyədə təmin edəcək əsas komponentlərdən birinin də süni intellekt olacağı danılmaz faktdır. Süni intellektin inkişafı yaxın gələcəkdə qlobal cəmiyyətin sosial-iqtisadi, əqli-intellektual və mədəni simasının əsaslı şəkildə dəyişəcəyini, keyfiyyətcə yeni ideallara, yüksək mahiyyət və dəyər kəsb edən struktur elementlərinə əsaslanacağını vəd edir. Bu dəyərlər içərisində üç mühüm əlaməti və ya hadisəni xüsusi olaraq qeyd etmək lazımdır.

1. Texnokratiya - İKT-nin, texnoloji tərəqqinin və süni intellektin fövqəladə inkişafı dalğasında yüksək texniki biliklərə sahib olan müasir intellektual elitanın hakimiyyətinin bərqərar edilməsi.

2. Smart texnologiyaların insan həyatının bütün sahələrinə - istehsalata, təhsilə, elmə, məişətə, xidmət sektoruna, idarəçilik sisteminə və s. tətbiqi.

3. Dördüncü sənaye inqilabı, 4:0 (ing. *The Fourth Industrial Revolution* - Klaus Şvabın 2016-cı ildə irəli sürdüyü konsepsiyaya əsaslanır. Dördüncü sənaye inqilabı bəşəriyyətin müasir simasını müəyyən edən ən mühüm və ardıcıl mərhələdir. Yaxın gələcəkdə istehsalatda kiberfiziki sistemlərdən geniş istifadə edilməsini nəzərdə tutur və yüksək təşəkküllü informasiya təminatı və süni intellektlə birlikdə tarixin gələcək inkişaf ssenarisini təyin edir (Ross, 2021, s. 155).

## Ədəbiyyat


1. Akhmedov, B.A. (2021). *Cluster methods for the development of thinking of students of informatics*. Academy, 3(66), 14
2. Jodłowiec, M. (2015). “*The Challenges of Explicit and Implicit Communication: A Relevance Theoretic Approach”*. Peter Lang, 25-192 (Text - Meaning - Context: Cracow Studies in English Language, Literature and Culture. Volume 11). - ISBN 978-3-631-65867-3.
3. Kavrorv, S.N. (2015). *«Tekhnologicheskiy postgumanizm: perekhod k postcheloveku i postchelovechestvu»*. M.: RosNOU, 57.
4. Luxton, D.D. (2014). “*Artificial intelligence in psychological practice: Current and future applications and implications*”. Professional Psychology: Research and Practice. Vol. 45, iss. 5, 331 https://doi.org /10.1037/a0034559
5. Matiyaskevich, YU.V. (2013). *«Alan T'yurink i teoriya risunka»*. Matematicheskoye prosveshcheniye». M.: Izd-vo MTNMO. Vyp. 17, 6.
6. Paiho, S., Tuominen, P., Rökman, J., Ylikerälä, M., Pajula, J., Siikavirta, H. (2022). “*Opportunites of collected city data for smart cities*”. IET Smart Cities. 4 (4), 276 https://doi.org/10.1049/smc2.12044
7. Rassel, S. (2021). *Iskusstvenniy intellekt: sovremenniy podkhod*. Styuart Rassel, Piter Norviq. - 4-e - Xoboken: Pirson, 18. ISBN978-5-907365-25-4
8. Ross, P., Maynard, K. (2021). “*Towards a $4^{th}$ industrial revolution. Intelligent Buildings International*”. 13 (3), 155-156. https://doi. Org /10. 1080/17508975.2021.1873625
9. Turuqulova, N., Vesirkepova, A., Bükseytova, A., Kabdoldina, N. (2016). *Sostav i spospbi sozdaniya vnutrimashinnogo informatsionnogo obespecheniya i organizatsiya dannikh vo vnutrimashinnoy sfere.* Moskva: Mezhdunarodniy jurnal eksperimentalnogo obrazovaniya. № 5-3, 352.
10. Vines, T.H., Albert, Arianne, Y.K., Andrew, Rose, L., Débarre, F., Bock, D.G., Franklin, M.T., Gilbert, K.J., Moore, J. -S., Renaut, S., Rennison, D.J. (2014). “*The availability of research data declines rapidly with article age*”. Current Biology. 24(1), 95. DOI:10.1016/j.cub.2013.11.014


Daxil oldu: 22.12.2024
Qəbul edildi: 27.03.2025

DOI: https://doi.org/10.36719/2663-4619/114/312-315

**Sibel Həsənova**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
magistrant
https://orcid.org/0009-0000-3868-6966
sibel.hsnva999@gmail.com

# Yeni İT həllərinin tətbiqi bankların mənfəətliliyini necə artırır

**Xülasə**

Müasir dövrdə bank sektorunda rəqabətin artması yeni İT həllərinin tətbiqini zəruri edir. Bulud texnologiyaları, süni intellekt, blokçeyn və böyük məlumat analitikası kimi innovativ texnologiyalar bank əməliyyatlarının səmərəliliyini artırır, əməliyyat xərclərini azaldır və müştəri təcrübəsini yaxşılaşdırır. Avtomatlaşdırma və rəqəmsal bankçılıq həlləri insan resurslarına olan tələbatı azaldaraq daha sürətli və təhlükəsiz xidmətlər təqdim etməyə imkan yaradır. Bu inkişaflar nəticəsində bankların gəlirliliyi artır, müştəri bazası genişlənir və risklər daha effektiv idarə olunur.

***Açar sözlər:*** *İT həlləri, bank mənfəətliliyi, rəqəmsal transformasiya, süni intellekt, bulud texnologiyaları, blokçeyn, avtomatlaşdırma, rəqəmsal bankçılıq, müştəri təcrübəsi, risklərin idarə olunması*

**Sibel Hasanova**
The Academy of Public Administration under the
President of the Republic of Azerbaijan
Master student
https://orcid.org/0009-0000-3868-6966
sibel.hsnva999@gmail.com

# How the Implementation of New IT Solutions Increases Bank Profitability

**Abstract**

In the modern era, increasing competition in the banking sector makes the implementation of new IT solutions essential. Innovative technologies such as cloud computing, artificial intelligence, blockchain, and big data analytics enhance operational efficiency, reduce costs, and improve customer experience. Automation and digital banking solutions reduce the need for human resources, enabling faster and more secure services. As a result of these advancements, banks experience higher profitability, an expanded customer base, and more effective risk management.

***Keywords:*** *IT solutions, bank profitability, digital transformation, artificial intelligence, cloud technologies, blockchain, automation, digital banking, customer experience, risk management*

## Giriş

Müasir dövrdə bank sektoru sürətlə inkişaf edən rəqəmsal texnologiyalar sayəsində böyük dəyişikliklərə məruz qalır. Banklar müştərilərə daha rahat, təhlükəsiz və səmərəli xidmətlər göstərmək üçün yeni İT həllərini tətbiq edirlər. Süni intellekt, bulud texnologiyaları, blokçeyn və avtomatlaşdırma kimi innovativ texnologiyalar bank əməliyyatlarının effektivliyini artırmaqla yanaşı, xərcləri azaldır və gəlirliliyi yüksəldir. Bu tədqiqat yeni İT həllərinin bank sektorunda mənfəətliliyə necə təsir etdiyini araşdırır və onların tətbiqinin potensial üstünlüklərini təhlil edir.

**Tədqiqat**

Müasir bank sektoru sürətlə inkişaf edən rəqəmsal texnologiyalar hesabına ciddi dəyişikliklərə məruz qalır. Banklar müştərilərinə daha çevik, təhlükəsiz və effektiv xidmətlər təqdim etmək üçün innovativ İT həllərindən istifadə edirlər. Rəqəmsal transformasiya bank əməliyyatlarının

avtomatlaşdırılmasına, müştəri xidmətlərinin fərdiləşdirilməsinə və risklərin idarə olunmasının təkmilləşdirilməsinə şərait yaradır (Zhu, 2023).

Bank sektorunda İT həllərinin tətbiqi bir neçə əsas sahədə özünü göstərir. Əməliyyatların sürətləndirilməsi və avtomatlaşdırılması nəticəsində banklar artıq əl ilə icra olunan bir çox prosesi optimallaşdıraraq həm müştəri rahatlığını artırır, həm də əməliyyat xərclərini azaldır. Süni intellekt və böyük məlumat analitikası bankların müştərilərin davranışlarını analiz etməsinə və fərdi maliyyə həlləri təklif etməsinə imkan yaradır. Bununla yanaşı, təhlükəsizlik bank sektorunda ən vacib məsələlərdən biridir və müasir texnologiyaların tətbiqi kiberhücumların qarşısını almaqda mühüm rol oynayır. Biometrik autentifikasiya, blokçeyn texnologiyası və digər qabaqcıl həllər bank sistemlərinin daha etibarlı olmasını təmin edir (Mallet, 2024).

Rəqəmsal transformasiya banklar üçün yalnız üstünlük deyil, həm də zərurətə çevrilib. Rəqəmsal bankçılıq tətbiqlərinin artması və müştərilərin ənənəvi bankçılıq xidmətlərindən uzaqlaşması bankları rəqəmsallaşmaya daha çox investisiya qoymağa məcbur edir. Bu prosesin əsas üstünlüklərinə xərclərin optimallaşdırılması, müştəri bazasının genişləndirilməsi və maliyyə əməliyyatlarının daha sürətli icra olunması daxildir. Rəqəmsal həllərin tətbiqi bankların filial şəbəkəsinə olan ehtiyacını azaldır və işçi resurslarına qənaət etməyə imkan yaradır. Mobil və onlayn bankçılıq həlləri coğrafi sərhədləri aradan qaldıraraq daha geniş auditoriyaya xidmət göstərməyə imkan verir. Xüsusilə blokçeyn texnologiyasının tətbiqi beynəlxalq tranzaksiyaları daha tez və daha aşağı komissiya ilə icra etməyə şərait yaradır (Arner, Barberis, Buckley, 2017).

Yeni İT həlləri bankların xidmətlərini daha səmərəli və müştəriyönümlü etmək üçün tətbiq edilir. Rəqəmsal texnologiyalar banklara yeni məhsul və xidmətlər təqdim etmək, müştərilərin ehtiyaclarına uyğunlaşmaq və onlarla daha yaxın əlaqə qurmaq imkanı verir. Bu texnologiyalar həmçinin bankların əməliyyatlarını sürətləndirir və xərcləri azaldır (Money Vehicle Team, 2024).

Mobil bankçılıq, internet bankçılığı və digər rəqəmsal xidmətlər bankların müştəri bazasını genişləndirməsinə və müştərilərinə daha rahat xidmət göstərməsinə imkan yaradır. Mobil bankçılıq, müştərilərin istədikləri vaxt və məkanda bank xidmətlərindən istifadə etməsini təmin edir. Banklar bu xidmətlər vasitəsilə müştərilərinin ehtiyaclarına uyğun müxtəlif məhsullar təqdim edir, məsələn, kreditlər, ödənişlər və investisiya məhsulları. Bu yeni məhsullar müştərilərin həyat tərzini asanlaşdırır və bankların gəlir mənbələrini artırır (Josyula, 2021).

Blockchain texnologiyası bankların əməliyyatlarını daha şəffaf və təhlükəsiz edir. Bu texnologiya, xüsusilə ödəniş sistemlərində, pul köçürmələrində və digər maliyyə əməliyyatlarında geniş istifadə olunur. Blockchain banklara əməliyyatları mərkəzləşdirilməmiş şəkildə həyata keçirməyə və saxtakarlığı qarşısını almağa imkan verir. Bu texnologiyanın tətbiqi bankların xidmətlərini daha etibarlı edir və müştəri etibarını artırır (Finextra, 2020).

Süni intellekt (AI) və maşın öyrənməsi (ML) bankların xidmətlərini daha fərdiləşdirilmiş və müştəriyönümlü edir. Süni intellekt banklara müştəri davranışlarını təhlil edərək onlara daha uyğun məhsullar təqdim etməyə imkan verir. AI həmçinin risklərin qiymətləndirilməsində və maliyyə cinayətlərinin qarşısının alınmasında istifadə olunur. Bu texnologiyalar bankların daha sürətli və düzgün qərarlar qəbul etmələrini təmin edir (Amjad, 2024).

Böyük məlumatlar və analitika banklara daha doğru biznes qərarları verməyə kömək edir. Müştəri məlumatlarını təhlil edərək, banklar onların maliyyə davranışlarını daha yaxşı anlamağa və fərdiləşdirilmiş xidmətlər təqdim etməyə başlayırlar. Analitika bankların gələcəkdəki riskləri daha düzgün qiymətləndirmələrinə və strateji qərarlar almalarına imkan verir. Böyük məlumatlar həmçinin marketinq sahəsində də istifadə olunur, çünki banklar müştəri tələblərini əvvəlcədən təhlil edərək daha effektiv marketinq strategiyaları tətbiq edə bilirlər (Həbibov, İsmayılov, 2024).

Yeni texnologiyalar həmçinin bankların əməliyyat xərclərini azaldır. Elektron ödəniş sistemləri, mobil ödənişlər və digər rəqəmsal xidmətlər banklara fiziki filiallar saxlamağa ehtiyac qalmadan müştərilərə xidmət göstərməyə imkan verir. Bu da əməliyyat xərclərini ciddi şəkildə azaldır və bankların mənfəətini artırır (Codebase, 2023).

Bütün bu texnologiyalar bankların bazar mühitində daha rəqabətqabiliyyətli olmalarına şərait yaradır. Banklar yeni texnologiyaları tətbiq edərək müştərilərə daha keyfiyyətli xidmətlər təqdim edə bilir, bu isə onların bazar payını artırır. Yeni xidmətlər və təkliflər bankların gəlir mənbələrini

genişləndirir və onlara bazarda lider mövqe tutmağa imkan verir. Rəqəmsal transformasiya, həmçinin bankların strateji planlama və innovasiya sahəsində də irəliləyiş əldə etmələrini təmin edir (UXDA, 2024).

Yeni İT həlləri, xüsusilə süni intellekt (AI) və maşın öyrənməsi (ML), bankların əməliyyatlarını daha sürətli və effektiv etməyə kömək edir. Müştəri xidmətlərində bu texnologiyalar müştərilərin sorğularına daha sürətli cavab verməyə və fərdiləşdirilmiş xidmətlər təklif etməyə imkan verir. Chatbotlar və virtual köməkçilər, bankların müştəri məmnuniyyətini artıraraq əməliyyat xərclərini azaldır. AI, həmçinin müştəri davranışlarını təhlil edərək onların gələcəkdəki ehtiyaclarını proqnozlaşdırmağa kömək edir.

Risk idarəetməsi sahəsində AI və ML banklara daha dəqiq kredit qiymətləndirməsi və riskləri əvvəlcədən müəyyənləşdirmə imkanı yaradır. Bu texnologiyalar kredit müraciətlərini daha düzgün qiymətləndirməyə və bankların mənfəətini artırmağa kömək edir. Həmçinin, AI və ML maliyyə əməliyyatlarını avtomatlaşdırır, xüsusilə pul köçürmələri və ödənişlər kimi əməliyyatlarda sürəti artırır və daha təhlükəsiz xidmətlər təqdim edir.

Bu texnologiyalar həmçinin maliyyə cinayətlərinin qarşısını almağa kömək edir. Süni intellekt, şübhəli əməliyyatları real vaxtda izləyir və dərhal müdaxilə edir. Nəticədə, banklar daha etibarlı və təhlükəsiz mühitlər yaradır, əməliyyatları daha səmərəli həyata keçirir və müştəri ehtiyaclarını daha yaxşı qarşılamağa imkan verir.

Bütün bu texnologiyalar bankların fəaliyyətlərinin daha səmərəli, təhlükəsiz və müştəriyönümlü olmasına şərait yaradır. Süni intellekt və maşın öyrənməsi, banklara daha çevik və rəqabətə dayanıqlı olmaq üçün güclü imkanlar təqdim edir. Bu texnologiyalar həmçinin bankların gəlir modellərini diversifikasiya etməyə, müştəri ehtiyaclarını qarşılamağa və əməliyyat xərclərini azaldmağa kömək edir (Deloitte, 2024).

Yeni İT həlləri bankların rəqabət qabiliyyətini artıraraq müştəri məmnuniyyətini yüksəltməyə imkan verir. Mobil və internet bankçılığı müştərilərə 24/7 xidmət göstərməyə, maliyyə əməliyyatlarını sürətli və rahat şəkildə icra etməyə şərait yaradır. Bu texnologiyalar bankların müştəri bazasını genişləndirməsinə və fərdiləşdirilmiş xidmətlər təqdim etməsinə kömək edir.

Blockchain texnologiyası ödəniş və pul köçürmələrində təhlükəsizliyi və şəffaflığı artıraraq maliyyə cinayətlərinin qarşısını alır. Süni intellekt və maşın öyrənməsi isə müştəri davranışlarını təhlil edərək daha uyğun xidmətlər təklif etməyə, kredit qiymətləndirməsini təkmilləşdirməyə və əməliyyat xərclərini azaltmağa kömək edir.

Bu texnologiyalar bankların bazar mövqeyini gücləndirərək yeni müştəri qruplarına çıxışını genişləndirir. Elektron ödənişlər və rəqəmsal həllər bankların fəaliyyətini optimallaşdıraraq əməliyyatları daha səmərəli və sürətli edir. Nəticədə, banklar bazar paylarını artırır və uzunmüddətli rəqabət üstünlüyü qazanır.

## Nəticə

Yeni İT həlləri bank sektorunda əməliyyatları optimallaşdırır, müştəri xidmətlərini təkmilləşdirir və risk idarəetməsini effektiv edir. Süni intellekt, maşın öyrənməsi, blockchain və mobil bankçılıq kimi texnologiyalar banklara rəqabət üstünlüyü, əməliyyat xərclərinin azaldılması və gəlirlərin artması imkanı yaradır. Rəqəmsal transformasiya müştərilərə 24/7 xidmət göstərərək, müştəri məmnuniyyətini artırır. Süni intellekt və maşın öyrənməsi banklara müştəri davranışlarını təhlil etməyə və onlara fərdiləşdirilmiş xidmətlər təqdim etməyə kömək edir. Risk idarəetməsi və maliyyə cinayətlərinin qarşısının alınması da yeni İT həlləri ilə daha yaxşı həyata keçirilir. Nəticə olaraq, bu texnologiyalar bankların inkişafını və rəqabət qabiliyyətini artırır.

## Ədəbiyyat

1. Amjad, A. (2024, December). The rise of Fintech: Transforming Financial Services and the Role of Finance Professionals. Fintechweekly.com.
2. Arner, D.W., Barberis, J., Buckley, R.P. (2017). FinTech, RegTech, and the Reconceptualization of Financial Regulation. *Northwestern Journal of International Law & Business*, 37(3), 371-413. https://scholarlycommons.law.northwestern.edu/njilb/vol37/iss3/2

3. Codebase. (2023). *Redefining Banking: Unleashing the Power of Digital Banking Solutions*. Codebtech.com.
4. Deloitte. (2020, 22 iyul). *Artificial intelligence and blockchain in banking: A new era of digital transformation*. Deloitte Insights.
5. Deloitte. (2024). *Bank of 2030: Transform boldly*. Deloitte.com.
6. Finextra. (2020, 5 oktyabr). *AI in banking: Transforming the customer experience and operational efficiency*. Finextra. https://www.finextra.com/blogposting/19843/ai-in-banking-transforming-the-customer-experience-and-operational-efficiency
7. Həbibov, İ., İsmayılov, A. (2024). Azərbaycanda bank sektorunun innovativ məhsul və xidmət səviyyəsi: problemlər və həlli yolları. TIM Jurnal. https://timjurnal.az/uploads/2025/01/ismayil-hebibov.pdf
https://www.codebtech.com/digital-banking-solutions-revolutionizing-the-financial-industry/
https://www.deloitte.com/ng/en/Industries/financial-services/perspectives/bank-of-2030-the-future-of-banking.html
https://www.fintechweekly.com/magazine/articles/the-rise-of-fintech-transforming-financial-services-and-the-role-of-finance-professionals
https://www2.deloitte.com/content/dam/Deloitte/us/Documents/process-and-operations/us-ai-transforming-future-of-banking.pdf
8. Josyula, H.P. (2021). *The Role of Fintech in the future of banking services*. *ResearchGate*. https://www.researchgate.net/publication/378902248_THE_ROLE_OF_FINTECH_IN_SHAPING_THE_FUTURE_OF_BANKING_SERVICES
9. Mallet, E. (2024, February). A Look Ahead: Opportunities and Challenges of AI in the Loeb.com. https://www.loeb.com/en/insights/publications/2024/02/a-look-ahead-opportunities-and-challenges-of-ai-in-the-banking-industry
10. Money Vehicle Team. (2024, March). Digital banking 2024: Exploring the evolution and its impacts. Yourmoneyvehicle.com. https://yourmoneyvehicle.com/banking/digital-banking-2024-exploring-the-evolution-and-its-impacts/#:~:text=In%20conclusion%2C%20digital%20banking%20represents,for%20banks%20and%20customers%20alike.
11. UXDA. (2024). *Digital Banking ROI: How Product Design Increases Bank Profits*. Theuxda.com. https://theuxda.com/blog/revolutionizing-finance-can-product-design-increase-banks-profits#:~:text=This%20automation%20leads%20to%20substantial, the%20ROI%20of%20digital%20banking.
12. Zhu, Z. (2023). *The Role of Fintech in the Innovation and Transformation of the Banking Industry*. *ResearchGate*. https://doi.org/10.54254/2754-1169/16/20230958

Daxil oldu: 18.12.2024
Qəbul edildi: 23.03.2025

## İÇİNDƏKİLƏR
## CONTENTS

### HUMANİTAR VƏ İCTİMAİ ELMLƏR
### HUMANITIES AND SOCIAL SCIENCES

## TƏBİƏT ELMLƏRİ
## NATURAL SCIENCES

## RİYAZİYYAT VƏ MEXANİKA ELMLƏRİ
## MATHEMATICAL AND MECHANICAL SCIENCES



## TEXNİKA ELMLƏRİ
## TECHNICAL SCIENCES

